ÜMUMMİLLİ LİDER HEYDƏR ƏLİYEV - 90



QƏZET 01.02.1958-ci İLDƏN ÇIXIR

# GƏNC MÜƏLLİM

BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!
Məhəmməd Peyğəmbər (S.)

XÜSUSİ BURAXILIŞ
Aprel 2013
04 (1048)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ



## Dünyanın ən nüfuzlu şəxsləri Heydər Əliyev haqqında

***Bill Klinton:***
"Heydər Əliyev təkcə Azərbaycanı, Amerikanı yox, bütün dünyanı idarə etməyi bacaran bir siyasi xadimdir".

* * *

***Vladimir Putin:***
"Heydər Əliyev böyük dövlət xadimi idi. Mübaliğəsiz demək olar ki, siyasət nəhəngi idi. Mən ona, sadəcə, böyük hörmətlə yanaşmırdım, mən ona məhəbbət bəsləyirdim".

* * *

***Marqaret Tetçer:***
"Azərbaycan Prezidenti Heydər Əliyev müasir zəmanəmizin görkəmli siyasi xadimlərindən biridir".

* * *

***Madlen Olbrayt:***
"Cənab Heydər Əliyev Corc Vaşinqtona bərabər şəxsiyyət və Amerikanın böyük dostudur".

* * *

***Bülənt Ecevit:***
"Heydər Əlirza oğlu Atatürk qədər qüdrətli bir türkdür".

* * *

***Jak Şirak:***
"Heydər Əliyevin rəhbərliyi altında Azərbaycanı böyük gələcək gözləyir".

* * *

***Eduard Şevardnadze:***
"XX əsr liderlər əsridir. Heydər Əliyev isə əsrimizin lideridir".

* * *

***Qrerq Laftin:***
"Heydər Əliyev Mərkəzi Asiyanın Corc Vaşinqtonudur".

* * *

***Leonid Kuçma:***
"Heydər Əliyev Zaqafqaziya regionunda, Avropa qitəsində və dünyada layiqli yer tutan Azərbaycanın şöhrətini öz fəaliyyəti ilə artırmışdır. O, dünya miqyaslı dövlət xadimidir".

* * *

***Namiq Kamal Zeybək:***
"Heydər Əliyev bütün Türk dünyasının lideridir. Mən onun zəkası, ağlı, düşüncəsi, cəsarəti qarşısında baş əyirəm".

* * *

***Aleksandr Budbero:***
"Heydər Əliyev Simurq quşu kimi yenidən pərvazlanaraq bütün dünyanı onunla hesablaşmağa məcbur etdi".

* * *

***Riçard Şelbi:***
"Azərbaycan Prezidenti Heydər Əliyev öz ölkəsinin müstəqilliyini qoruyub saxlamağı bacaran nadir şəxsiyyətlərdəndir".

* * *

***Nikolay Baybakov:***
"Mən Azərbaycanı, Azərbaycan xalqını Heydər Əliyev qədər sevən ikinci bir adam tanımıram".

* * *

***İslam Kərimov:***
"Heydər Əliyev kimi rəhbəri olan xalq xoşbəxtdir".

* * *

***Villem Van Vout:***
"Belə bir kəlam var: "İnsan öz ömrü boyu ağac əkməli, ev tikməli və oğul böyütməlidir. Heydər Əliyev bu işlərin hamısını görmüşdür. Heydər Əliyev öz ömrü boyu çiçəklənən "Azərbaycan" adlı bir bağ salmışdır. Heydər Əliyev öz ömrü boyu adı "Müstəqil Azərbaycan" olan bir ev qurmuşdur. Heydər Əliyev onun şərəfli və məsuliyyətli işini bu gün davam etdirən, Azərbaycan xalqının gələcəyini etibar etdiyi ləyaqətli bir oğul böyütmüşdür".

## Elmi Şuranın iclasında

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Elmi Şurasının aprel ayının 15-də keçirilən iclasının gündəliyində aşağıdakı məsələlər dururdu: Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyevin 90 illik yubileyi ilə bağlı ADPU-da görülmüş işlər və nəzərdə tutulan tədbirlər barədə məsul şəxslərin məlumatı (ADPU-nun Tədris işləri üzrə prorektoru, professor Malik Cəbrayılov; ADPU-nun elmi işlər üzrə prorektoru, professor Vilayət Əliyev; ADPU-nun Tərbiyə işləri üzrə prorektoru, professor Rafiq Baxşəliyev); Türkiyənin Qazi Universitetinin professoru xanım Alev Çakmakoğlu Kuruya ADPU-nun fəxri doktoru adının verilməsi; ADPU-nun Tədris-Metodiki Şurasının Əsasnaməsinin və Şuranın yeni tərkibinin təsdiqi (ADPU-nun Tədris işləri üzrə prorektoru, professor Malik Cəbrayılov); 2012-ci ildə professor-müəllim heyətinin elmi-tədqiqat işləri barədə hesabat (ADPU-nun Elmi işlər üzrə prorektoru, professor Vilayət Əliyev); 2012-ci ildə fəlsəfə doktoru proqramı üzrə doktoranturaya, fəlsəfə doktoru və elmlər doktoru proqramları üzrə dissertanturaya qəbulun nəticələri (ADPU-nun Magistratura və doktorantura şöbəsinin müdiri, professor İbrahim Bayramov); Cari məsələlər və kafedralar üzrə professor vəzifəsinə seçkilər.

* * *

İclası giriş sözü ilə açan ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Elmi Şuranın sədri, professor Yusif Məmmədov ümummilli lider Heydər Əliyevin 90 illik yubileyi münasibətilə bütün ölkədə, o cümlədən ADPU-da da silsilə tədbirlər həyata keçirildiyini söylədi. Bu tədbirlər nədən ibarətdir?

Tədris işləri üzrə prorektor, professor Malik Cəbrayılov xalqımızın ümummilli lideri Heydər Əliyevin 90 illik yubileyi ilə əlaqədar ADPU-da tədris sahəsində görülən işlər haqqında danışarkən dedi ki, Ümummilli Lider dəfələrlə ölkənin inkişafının təhsil sahəsi ilə sıx bağlı olduğunu xüsusi qeyd etmişdir. Onun respublika üçün yüksəkixtisaslı kadr hazırlığı ilə bağlı strategiyası bu gün Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyev tərəfindən uğurla davam etdirilir. Cənab Prezidentin təhsilin inkişafı ilə bağlı imzaladığı çoxsaylı sərəncamlar bu gün ölkədə təhsilin yüksək səviyyədə inkişafını təmin edir.

Ulu Öndərin təhsil strategiyasının həyata keçməsi üçün onun elmi irsinin öyrənilməsi xüsusi əhəmiyyət kəsb edir. Əslində, bu iş bizim gündəlik fəaliyyətimizin hərəkətverici qüvvəsidir.

Bir neçə ildir ki, Tarix fakültəsində "Heydər Əliyev və Azərbaycan Konstitusiyası", Filologiya fakültəsində isə "Heydər Əliyev və ədəbiyyat məsələləri" adlı kurslar seçmə fənn kimi tədris olunur. "Heydər Əliyev və Azərbaycan Konstitusiyası" kursunun proqramı professor Ənvər Seyidov, "Heydər Əliyev və ədəbiyyat məsələləri" kursunun proqramı isə professor Tərlan Novruzov tərəfindən tərtib edilmişdir. Hesab edirik ki, Ulu Öndərin təhsil sahəsi ilə bağlı ideyalarının öyrənilməsi tələbələrimizin müəllimlik fəaliyyəti dövründə səmərəli nəticələr verər.




Növbəti tədris ilindən Pedaqoji fakültədə "Heydər Əliyev - Azərbaycan təhsili" adlı seçmə fənnin tədrisi nəzərdə tutulur. Bu fənnin tədrisi zamanı XX əsrin 70-ci illərindən başlayaraq müstəqillik dövrü də daxil olmaqla Ulu Öndərin təhsilimizin inkişafı ilə bağlı fikirləri şərh olunacaq. Ulu Öndərin 90 illik yubileyi ilə bağlı ADPU-nun rektoru, professor Yusif Məmmədovun 15.02.2013-cü il tarixli əmr ilə təsdiq olunmuş tədbirlər planına uyğun olaraq may ayının 10-da ilk dərslər Ulu Öndərin həyat və fəaliyyətinə həsr olunacaq.

Universitetin Elmi işlər üzrə prorektoru, professor Vilayət Əliyevin çıxışında Ümummilli Liderin 90 illik yubileyi münasibəti ilə həyata keçiriləcək beynəlxalq və

(Davamı 2-ci səhifədə)

# Elmi Şuranın iclasında



(Əvvəli 1-ci səhifədə)

respublika elmi konfransları, eləcə də ayrı-ayrı fakültə və kafedralarda həyata keçiriləcək tədbirlər haqqında məlumatlar diqqəti çəkdi. Professor Vilayət Əliyev dedi: "Bilirsiniz ki, ölkə Prezidenti cənab İlham Əliyevin Ulu Öndərin 90 illik yubileyinin dövlət səviyyəsində geniş miqyasda keçirilməsi haqqında sərəncamı var. Həmin sərəncama uyğun olaraq Pedaqoji Universitetin kollektivi də bir çox tədbirlər, o cümlədən 1 beynəlxalq və 3 respublika elmi konfransı keçirəcəkdir.

Universitetimizin Qərb Universiteti ilə "Ekoloji problemlər və ekoloji təhsil" mövzusunda birgə keçirəcəyi respublika elmi konfransında universitetimizdən plenar iclasda 1 məruzə, bölmələrdə isə 43 məruzə və tezis dinləniləcəkdir.

Ulu Öndərin 90 illik yubileyi ilə bağlı digər bir respublika elmi konfransı isə Qərb Universitetində keçiriləcək. Aprel ayının 26-da baş tutacaq bu konfransda Pedaqoji Universitetdən 10 məruzə oxunacaq. Konfransın təşkilati məsələləri Filologiya fakültəsinin dekanı, professor Buludxan Xəlilova həvalə olunub. Həmin gün Ümummilli Liderin abidəsi ziyarət olunacaq, sonra konfrans öz işinə başlayacaq.

Elmi mübadilə xarakteri daşıyan belə tədbirlərin keçirilməsi ali təhsil müəssisələri arasında əlaqələri genişləndirir. Bu təklif də ADPU-nun rektoru, professor Yusif Məmmədov tərəfindən edilmişdir.

Yubileyə həsr edilmiş digər respublika elmi konfransı isə may ayının birinci ongünlüyünə təsadüf edir. Bu konfransda ediləcək məruzələr Heydər Əliyevin həyat və fəaliyyətinin Azərbaycanla bağlı olan dövrünə həsr olunur. Məqalələr ADPU-nun "Pedaqoji Universitet Xəbərləri" toplusunun xüsusi buraxılışında çap olunacaq".

Professor V.Əliyev bu mövzu ilə əlaqədar çıxışının sonunda dedi: "Bilirsiniz ki, bu il həm də görkəmli oftalmoloq alim, akademik Zərifə xanım Əliyevanın anadan olmasının 90 ili tamam olur. Zərifə xanımın da 90 illik yubileyi respublika səviyyəsində qeyd olunur. Bu münasibətlə də tədbir keçirməyimiz nəzərdə tutulur.

Ulu Öndərin 90 illik yubileyi ilə bağlı "Gənc müəllim" qəzetinin xüsusi buraxılışının çap edilməsi də nəzərdə tutulur.

Bundan əlavə, universitet professor-müəllimlərinin Heydər Əliyevin 90 illik yubileyinə həsr edilmiş məqalələrlə respublika mətbuatında çıxışları, ayrı-ayrı fakültələrdə müxtəlif səpkili tədbirlərin keçirilməsi də nəzərdə tutulub. Tələbə və magistrantlarımızın da Heydər Əliyevin 90 illik yubileyinə həsr edilmiş konfransları keçiriləcək ki, həmin materiallar da toplu halında işıq üzü görəcək. Həmçinin ayrı-ayrı fakültələrdə Ulu Öndərin 90 illik yubileyinə həsr edilmiş açıq dərslərin keçirilməsi və məqalələr toplusunun çapı nəzərdə tutulub".

Universitetin Tərbiyə işləri üzrə prorektoru, professor Rafiq Baxşəliyevin çıxışından məlum oldu ki, bu ilin əvvəlindən bütün fakültələrdə ümummilli lider Heydər Əliyevin anadan olmasının 90 illik yubileyinə həsr olunmuş elmi-praktik konfransların keçiriləcəyi zamanı əks etdirən cədvəl tərtib olunmuşdur. Cədvəl üzrə aprelin 15-dən 30-dək bütün fakültələrdə elmi-praktik konfransların keçirilməsi nəzərdə tutulmuşdur. Təhsil Nazirliyi ilə Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqı Respublika Komitəsinin birgə qərarı əsasında keçirilən ulu öndər Heydər Əliyevin 90 illik yubileyinə həsr edilmiş ali məktəb tələbələrinin bədii yaradıcılıq festivalında ADPU-nun tələbələri də fəal iştirak edirlər. Aprelin 9-da isə ADPU-da seçim turu olmuşdur. Seçim turunda universitetimizin xor kollektivinin və xalq çalğı alətləri ansamblı üzvlərinin, şeir-qiraət, vokal oxuma, saz musiqisi üzrə tələbələrin ifası dinlənilmiş, bədii yaradıcılıq festivalında iştirak edəcək qaliblər müəyyənləşdirilmişdir. Bundan başqa, aprel ayının 11-də Gənclər və İdman Nazirliyi ADPU ilə birlikdə musiqi bayramı keçirmişlər. Aprelin 17-də isə universitetdə idmanın voleybol, şahmat, dama və nərd növləri üzrə keçiriləcək spartakiadaya start veriləcəkdir.

Professor R.Baxşəliyev universitetimizin futbol, oğlan və qızlardan ibarət basketbol komandalarının respublikanın ali məktəb tələbələri arasında ulu öndər Heydər Əliyevin 90 illik yubileyinə həsr olunmuş yarışlarda, həmçinin həmin komandaların YAP-ın Səbail rayonu təşkilatının yığma komandasının tərkibində ali məktəb tələbələrinin respublika çempionatında iştirak etdiyini də söyləmişdir.

***

Türkiyənin Qazi Universitetinin professoru xanım Alev Çakmakoğlu Kuruya ADPU-nun fəxri doktoru adının verilməsindən danışan rektor Y.Məmmədov onun Azərbaycan həqiqətlərinin dünyaya çatdırılmasında əvəzsiz xidmətlərini xüsusi qeyd etdi.

Elmi Şura xanım Alev Çakmakoğlu Kuruya "ADPU-nun fəxri doktoru" adının verilməsi barədə qərar qəbul etdi.

Tədris işləri üzrə prorektor, professor M.Cəbrayılovun ADPU-nun Tədris-Metodika Şurasının Əsasnaməsi və Şuranın yeni tərkibi haqqında məlumatı, universitetin Elmi işlər üzrə prorektoru, professor V.Əliyevin 2012-ci ildə professor-müəllim heyətinin elmi-tədqiqat işləri barədə hesabatı, 2012-ci ildə fəlsəfə doktoru proqramı üzrə doktoranturaya, fəlsəfə doktoru və elmlər doktoru proqramı üzrə dissertanturaya qəbulun nəticələri barədə isə Magistratura və doktorantura şöbəsinin müdiri, professor İbrahim Bayramovun hesabatı dinlənilərək qəbul edildi.

Elmi Şurada həmçinin "İlin müəllimi" nominasiyası üzrə keçirilən müsabiqə qaliblərinə diplomlar təqdim olundu, pedaqoji təcrübənin yekunları ilə əlaqədar ADPU-ya daxil olan təşəkkür məktubları oxundu.

Universitet əməkdaşlarının maaşlarına əlavələrin artırılması barədə xəbər, həmçinin rektor Y.Məmmədovun Novruz bayramı münasibəti ilə keçirdikləri yüksək səviyyəli tədbirə görə YAP-ın ADPU Qadınlar Şurasına, eyni zamanda keçirdiyi silsilə xeyriyyə tədbirlərə görə AQAC-ın ADPU üzrə bölməsinə təşəkkür elan etməsi hamı tərəfindən razılıqla qarşılandı.

Sonda kafedralar üzrə professor vəzifələrinə seçkilər keçirildi.

**Ayətxan Ziyatxanoğlu**

# "Ekoloji problemlər və ekoloji təhsil"

## *ADPU-nun Qərb Universiteti ilə birgə keçirdiyi respublika elmi konfransı*

**Ulu öndər Heydər Əliyevin 90 illik yubileyi münasibətilə aprel ayının 23-24-də keçirilən konfransda Qərb Universitetinin rektoru Zemfira Məmmədova, respublikamızın ekologiya sahəsi üzrə tanınmış mütəxəssisləri, o cümlədən professor Qara Mustafayev, AMEA-nın Neft-Kimya Prosesləri İnstitutunun direktoru, AMEA-nın müxbir üzvü, professor Vaqif Abbasov, AMEA-nın Coğrafiya İnstitutunun, respublikamızın bir çox ali təhsil müəssisələrinin, Ekologiya və Təbii Sərvətlər Nazirliyinin və digər təşkilatların nümayəndələri iştirak edirdilər.**

**Konfransı giriş sözü ilə ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, professor Yusif Məmmədov açdı. Öncə ümummilli lider Heydər Əliyevin əziz xatirəsi bir dəqiqəlik sükutla yad edildi.**

***

Ümummilli lider Heydər Əliyevin 90 illik yubileyi ilə əlaqədar universitetdə həyata keçirilən silsilə tədbirlərdən söz açan rektor Yusif Məmmədov bu işə fevral ayından başlanıldığını söylədi. Fakültələrdə bu münasibətlə elmi-praktik konfransların, müsabiqələrin, sərgilərin, müxtəlif idman yarışlarının, həmçinin özfəaliyyət kollektivi üzvlərinin musiqi yarışmalarının keçirildiyini və bu tədbirlərin davam etdiriləcəyini söylədi. Rektor Y.Məmmədov dedi: "Biz ümummilli lider Heydər Əliyevin anadan olmasının 90-cı ildönümü ərəfəsindəyik. Bu, hər bir vətənpərvər azərbaycanlı üçün, Azərbaycanı sevən, respublikamızın uğurlarından fərəhlənən insanlar üçün böyük bir bayramdır. Çünki bugünkü inkişafımızın, azərbaycançılıq ideologiyamızın banisi Heydər Əliyev həmin gün anadan olub. Bilirsiniz ki, bu bayramın dövlət səviyyəsində keçirilməsi üçün Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyev sərəncam imzalayıb. Təhsil Nazirliyində, bütün təhsil müəssisələrində, həmçinin ADPU-da müvafiq tədbirlər planı təsdiqlənib və hələ fevral ayından həmin tədbirlərin həyata keçirilməsinə başlanılıb. ADPU-nun Qərb Universiteti ilə birgə keçirdiyi respublika elmi konfransı da həmin tədbirlərdən biridir".

Rektor Yusif Məmmədov konfransın iki gün davam edəcəyini, üç bölmədə alimlər və mütəxəssislər tərəfindən 140-a yaxın məruzə ediləcəyini bildirdi. Bölmələrdə müasir qlobal ekoloji problemlər və onlardan çıxış yolları, qloballaşma zamanı yeni enerji mənbələrinin aşkarlanması zərurətləri, ətraf mühitin qorunmasının təbii-elmi problemləri, təbii resursların səmərəli istifadəsi, təbiət-biosfer-insan sistemi, ekoloji böhranlar və onların həlledilmə yolları barədə müzakirələr aparılacağını söylədi. Konfransın hazırlanmasında ADPU-nun Elmi işlər üzrə prorektoru, professor Vilayət Əliyevin xüsusi rolu olduğunu diqqətə çatdırdı.

Təbiətin qorunmasında, meşə zolaqlarının salınmasında Heydər Əliyevin xüsusi xidmətlərindən bəhs edən rektor Y.Məmmədov sovetlər dönəmində iməciliklərin keçirildiyi zamanları xatırladı. Belə iməciliklər zamanı da Ulu Öndərin ekologiyamızın qorunmasına xidmət edən mövqe nümayiş etdirdiyini, məhz onun iradəsi ilə Azərbaycanda ağaclar, yeni gül kolları əkildiyini, yaşıllaşdırma aparıldığını, mövcud yaşıllıqların isə abadlaşdırıldığını söylədi. Bu gün də respublikamızda bu ənənənin qorunduğunu, dövlət başçısı İlham Əliyevin müvafiq sərəncamları ilə yeni meşə zolaqlarının salınması, şoran torpaqlarının yuyulması, yeni parkların salınması, küçə və meydanlarda yeni yaşıllıqların salınması ümumiyyətlə, ekologiyamızın qorunması istiqamətində mühüm işlər həyata keçirildiyini, belə konfransların keçirilməsinin gənc nəslin ekoloji biliklərə yiyələnmələrində əhəmiyyətli rol oynadığını diqqətə çatdırdı.



Konfransda Qərb Universitetinin rektoru Zemfira Məmmədova çıxış edərək dahi şəxsiyyət, dünya miqyaslı siyasi xadim, Azərbaycanın taleyində, onun mənəvi, siyasi, iqtisadi, ictimai həyatında misilsiz xidmətlər göstərmiş ümummilli lider Heydər Əliyevin anadan olmasının 90 illik yubileyinə həsr olunmuş konfransın XXI əsrdə dünya ictimaiyyətini çox narahat edən olduqca aktual bir mövzuya həsr edildiyini söylədi. Bu gün dünya ictimaiyyətinin birləşərək qlobal istiləşmə, su, neft və kömür ehtiyatlarının tükənməsi və s. bu kimi problemlərlə mübarizə apardığı bir dövrdə belə bir konfransın keçirilməsi olduqca önəmlidir. Əgər biz bu gün ekoloji problemlərdən və onun həlli yollarından danışacağıqsa, aydın məsələdir ki, ilk növbədə ekoloji tərbiyə və ekoloji təhsildən, onun mühüm əhəmiyyətindən danışmalıyıq"-dedi. Qərb Universitetində davamlı inkişaf və ekoloji tərbiyə sahəsində görülən işlər barədə konfrans iştirakçılarını məlumatlandırdı.

Natiqin çıxışından o da məlum oldu ki, Qərb Universitetində hələ 1997-ci ildən dünyanın bir sıra tanınmış universitetləri ilə birlikdə magistr səviyyəsində kadr hazırlığı aparılır, tədris proqramlarına davamlı inkişaf, ətraf mühitin mühafizəsi, ekoloji siyasət və s. bu kimi fənlər daxil edilib, eyni zamanda bakalavr səviyyəsində də artıq "Ekologiya" ixtisası üzrə kadr hazırlığına başlanılıb, bu ali təhsil müəssisəsinin yetişdirdiyi kadrlar artıq müxtəlif sahələrdə çalışır, öhdələrinə düşən vəzifələri layiqincə yerinə yetirirlər.

Plenar iclasda professor Qara Mustafayevin, AMEA-nın Neft-Kimya Prosesləri İnstitutunun direktoru, AMEA-nın müxbir üzvü, professor Vaqif Abbasovun təbrikləri oldu. Eyni zamanda Ekologiya və Təbii Sərvətlər Nazirliyinin nümayəndəsi Amin Seyfiyev və Dövlət Neft Şirkətinin nümayəndəsi Füzuli Hacıyev təmsil etdikləri qurumların rəhbərliyinin konfransa təbriklərini oxudular.

ADPU-nun məzunu, AMEA-nın Neft-Kimya Prosesləri İnstitutunun direktoru, AMEA-nın müxbir üzvü, professor Vaqif Abbasovun çıxışı konfrans iştirakçıları, xüsusilə də zala toplaşmış tələbə-gənclər üçün bir çağırış oldu: "Çox fəxr edirəm ki, bu universitetin məzunuyam. Mən ilk imtahanı universitetin birinci mərtəbəsində yerləşən idman zalında vermişəm. Mənə elə müəllimlər dərs

(Davamı 3-cü səhifədə)

# "Ekoloji problemlər və ekoloji təhsil"

## ADPU-nun Qərb Universiteti ilə birgə keçirdiyi respublika elmi konfransı

(Əvvəli 2-ci səhifədə)

deyib ki, bu gün respublikamızda ən böyük institutlardan birinin direktoru olmaq şərəfinə nail olmuşam. Ona görə bu gün bu zalda əyləşən müəllimlərimə təşəkkür edir, dünyasını dəyişmiş müəllimlərimin ruhu qarşısında baş əyirəm. Tələbələrə deyirəm ki, harda təhsil almağın mənası yoxdur, əgər çalışsanız, yaxşı oxusanız, gələcəkdə sizi böyük uğurlar gözləyir. O ki qaldı bu gün bir yerə cəm olmağımızın səbəbinə, bu konfrans Azərbaycanın fövqəlekoloji dünyada ekoloji problemlərinin qaldırılmasına və həlli yollarını müəyyənləşdirməsinə xidmət edən elmi toplantıdır. Mən çox istərdim ki, bu mövzunun gündəmə gətirildiyi bütün toplantılarda Heydər Əliyev ilə Həsən Əliyevin adı bir çəkilsin. Bu iki qardaş dünyanın ən böyük ekoloqları sayılmalıdır. Həsən Əliyev Azərbaycanı qarış-qarış gəzdi, mövcud ekoloji problemləri təhlil etdi və onların həlli yollarını dövlət başçısına təqdim etdi. Bütün bu proseslər bundan sonra başladı.

Ulu öndər Heydər Əliyevin bir kəlamı var: "Kim bir ağac kəssə, hesab etsin ki mənim qolumu kəsir. Təsəvvür edin, öz böyük əməlləri ilə bugünkü müstəqil Azərbaycanı yaradan bir şəxs, bir ağacın kəsilməsini öz qolunun kəsilməsi kimi qəbul edən bir insan görün ekologiyanı necə qorumaq istəyində olub. Azərbaycanın bugünkü durumunda Heydər Əliyev bizim ən böyük ekoloqumuzdur.

İnsanın bədbəxtliyi fiziki ölümdə deyil, mənəvi ölümdədir. Heydər Əliyev kimi, Həsən Əliyev kimi insanlar cismən dünyalarını dəyişsələr də, onlar öz böyük əməlləri ilə tarixdə qalırlar. Bu, çox vacib məsələdir. Hər bir insan düşünməlidir ki, ömür sürdüyü zaman kəsiyində onun fiziki yaşamı min illərə uzanan mənəvi yaşamını təmin edirmi? Yox, əgər təmin etmirsə, o fiziki yaşam mənasızdır.

Burada bir məsələni xüsusi qeyd etmək istəyirəm. Biz "ekologiya" deyəndə çox vaxt ətraf mühitin mühafizəsini düşünürük. Bu belə deyil, əslində ilk növbədə insan ekologiyası qarşıya qoyulmalıdır. Əgər insan yoxdursa, bu dünyanın gözəlliyi heç kimə lazım deyil. Yəni dünya bu gün artıq düşünür ki, birinci insan ekologiyasıdır, sonra ətraf mühitin ekologiyası. Əgər insan ekologiyası varsa, ekoloji şüur olmadan bunu yaratmaq olmur, insanları zor gücünə ekoloji qaydalara riayət etməyə dəvət etmək olmur. Başqa sözlə, bir insanda ekoloji şüur yoxdursa, o, onillərə hesablanmış hərəkətlər edə bilmir. Ən azından öz evini, öz məhəlləsini, öz bölgəsini, öz ölkəsini müdafiə edə bilmir, bütövlükdə dünyanın problemlərini həll edə bilmir. Heydər Əliyevin qarşıya qoyduğu ən böyük problemlərdən biri də bu idi - ekoloji şüurun formalaşması! Çox yaxşı haldır ki, bəzi universitetlərimizdə ekoloji kimya, ekologiya fakültələri var, torpaqşünaslıq fakültəsində də bu problemlər qoyulur. Əslində düz edilir. Ətraf mühit, insan ekologiyası və ekoloji şüur problemləri həllini tapmadan sağlam dünyanın sabahından danışmaq mümkün deyil. Bu baxımdan hesab edirəm ki, konfransda bu məsələlər müzakirə olunmalıdır.

Çox fəxr edirəm ki, bizim Neft- Kimya Prosesləri İnstitutundan da konfransa 10 məqalə təqdim olunub. Məlumat üçün deyim ki, bizim institutda alternativ enerji mənbələri ilə bağlı 4 laboratoriya fəaliyyət göstərir. Düzdür, Azərbaycan neft və təbii qaz ölkəsidir, ancaq bu heç də bütün problemlərin neft və təbii qazın köməyilə həll edilməsi demək deyil. Biz öz ekologiyamızı qorumaq istəyiriksə, hökmən bioloji mənbələrdən, həm də səmərəli istifadə etməliyik.

Diqqətinizi bir məsələyə də yönəltmək istəyirəm: atmosfer havasında 21%-ə qədər oksigen var, əgər onun miqdarı 17, 18 %-ə enirsə, artıq insan depressiya vəziyyətinə düşür, özünü idarə etməkdə çətinlik çəkir, əgər oksigenin faizi atmosferdə 7%-ə düşərsə, bu, artıq böhran həddidir, ölüm qaçılmazdır. Ona görə də Yer üzünün sakinləri olan bizlər hər bir auditoriyada, evdə, məzildə mütləq insan ekologiyasını qorumaq və atmosferin çirklənməsinin qarşısını almaq barədə düşünməliyik. Dizel mühərriklərinin atmosferə atdığı aerozollar 8 saat havada tüğyan edir,onun tərkibində tam yanmamış yanacaq komponentləri olur ki, biz onu uduruq. Ağ ciyər və boğaz xərçəngi kimi qorxulu xəstəliklər məhz bu səbəblərdən yaranır. Bunlar nəzərə alınmadan dünyanın ekoloji mənzərəsini dəyişmək olmaz. Çox istərdim ki, gənclərimiz hər gün ekoloji problemləri, özlərinin ekologiyasını fikirləşsinlər, geyim paltarlarının özünün xüsusi ekologiyası var - bunu düşünsünlər. Nə üçün kətan, yun paltarlar bahadır, buna diqqət yetirsinlər. Unutmasınlar ki, özünü qorumadan dünyanı qorumaq olmaz".



* * *

Konfransda həmçinin ADPU-nun Fizika fakültəsinin dekanı, professor Mirzəli Murquzovun "Ekoloji sistemə sinergetik yanaşma" və Qərb Universitetinin dosenti Xəyyam Rəhimovun "Gözlənilən iqlim dəyişikliklərinin Azərbaycanın aqroiqlim resurslarına təsirinin qiymətləndirilməsi" mövzularında dərin məzmunlu məruzələri dinlənildi.

Konfransda eyni zamanda respublikamızın təbiətindən bəhs edən 6 qısametrajlı film də nümayiş etdirildi.

Sonra konfrans öz işini bölmələrdə davam etdirdi.

* * *

Ümummilli lider Heydər Əliyevin 90 illik yubileyinə həsr olunmuş "Ekoloji problemlər və ekoloji təhsil" mövzusunda iki gün davam edən respublika elmi konfransı öz işini aprel ayının 24-də başa çatdırdı. Yekun iclasında bölmə rəhbərlərinin məlumatları dinlənildi. ADPU-nun Elmi işlər üzrə prorektoru, professor Vilayət Əliyev bütövlükdə konfransın yüksək səviyyədə keçdiyini qeyd etdi.

**Ayətxan Ziyad**

*Zərifə Əliyeva-90*

# Görkəmli oftalmoloq alim, ictimai xadim, xeyirxah insan

## ADPU-da akademik Zərifə xanım Əliyevanın 90 illik yubileyinə həsr edilmiş tədbir keçirilib




Azərbaycan xalqının dünya şöhrətli oftalmoloq alimi, tibb elmləri doktoru, Əməkdar elm xadimi, Azərbaycan Milli Elmlər Akademiyasının həqiqi üzvü Zərifə xanım Əliyevanın anadan olmasından 90 il keçir. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev 2013-cü il fevral ayının 7-də akademik Zərifə xanım Əliyevanın 90 illik yubileyinin dövlət səviyyəsində keçirməsi haqqında sərəncam imzalamışdır. Hazırda bu sərəncama uyğun olaraq ölkəmizdə akademik Zərifə xanım Əliyevanın 90 illik yubileyinə həsr edilmiş müxtəlif tədbirlər keçirilir. Həmin tədbirlərdə akademik Zərifə xanım Əliyevanın böyük alim, tanınmış ictimai xadim, eyni zamanda nəcib və xeyirxah bir insan olması xüsusi qeyd edilir. Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) bu il aprel ayının 30-da akademik Zərifə xanım Əliyevanın 90 illik yubileyi münasibətilə keçirilən dəyirmi masada da onun oftalmologiya elminin inkişafında əvəzsiz xidmətlər göstərməsi, həmçinin ləyaqətli vətəndaş, həssas qəlbli qayğıkeş ana, xeyirxah insan olması haqqında maraqlı və məzmunlu çıxışlar edilmişdir.

Tədbir iştirakçıları dəyirmi masa başlamazdan öncə universitet tələbələrinin ümummili lider Heydər Əliyevin və akademik Zərifə xanım Əliyevanın 90 illik yubileyinə həsr edilmiş yaradıcılıq sərgisi ilə tanış olmuşlar. Sonra tədbir ADPU-nun "Heydər Əliyev məktəbinin lektoriyası"nda davam etdirilmişdir. İlk olaraq akademik Zərifə xanım Əliyevanın xatirəsi bir dəqiqəlik sükutla yad edilmişdir.

ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, professor Yusif Məmmədov dəyirmi masanı giriş sözü ilə açaraq bildirmişdir ki, universitetdə bugünədək akademik Zərifə xanım Əliyevanın 90 illik yubileyi ilə bağlı müxtəlif tədbirlər, o cümlədən ümumuniversitet elmi seminarı keçirilmiş, bu böyük alimin həyat və yaradıcılığını əks etdirən sərgi təşkil edilmiş, tələbələr üçün mühazirə və məruzələr oxunmuşdur. Bugünkü dəyirmi masa da akademik Zərifə xanım Əliyevanın 90 illik yubileyinə həsr edilib.

Rektor Yusif Məmmədov qeyd etdi ki, akademik Zərifə xanım Əliyeva böyük həkim, böyük alim və böyük insan olmuşdur. Professor Zərifə xanım Əliyeva Azərbaycan oftalmologiya elminə öz dəyərli töhfələrini vermiş, gənc mütəxəssislərin hazırlanmasında mühüm xidmətlər göstərmişdir. Zərifə xanım Əliyeva alim kimi böyük uğurlar qazanmışdır. Akademik Zərifə xanım Əliyevanın yüksək səviyyəli elmi əsərləri, monoqrafiyaları bu gün də öz aktuallığını saxlayır. O, Azərbaycan Milli Elmlər Akademiyasının həqiqi üzvü seçilmiş, həmçinin mükəmməl elmi-tədqiqatlarına görə qadınlar arasında ilk dəfə Sovet İttifaqının oftalmologiya elmi sahəsində ən yüksək mükafatı olan akademik Averbax adına mükafata layiq görülmüşdür.



Rektor Y.Məmmədov çıxışına davam edərək bildirdi ki, Zərifə xanım Əliyeva xalqımızın böyük oğlu, ümummilli liderimiz Heydər Əliyevin vəfalı ömür-gün yoldaşı olmuşdur. Zərifə xanım həmişə ulu öndər Heydər Əliyevə dayaq olmuş, onun bütün sevinc və kədərini bölüşmüşdür. Zərifə xanım möhtərəm Prezidentimiz cənab İlham Əliyevin anasıdır. Sadə, təvazökar, qayğıkeş, xeyirxah, yüksək davranış mədəniyyətinə malik olmuş Zərifə xanım əsl ziyalı idi. O, Azərbaycan qadınına xas olan bütün müsbət xüsusiyyətləri öz şəxsində cəmləşdirmişdi. Rektor Y.Məmmədov çıxışının sonunda tələbəgənclərə akademik Zərifə xanım Əliyevanın həyat və fəaliyyətini dərindən öyrənməyi tövsiyə etdi.

Dəyirmi masada Milli Məclisin deputatı, yazıçı-publisist Hüseynbala Mirələmov və Azərbaycan Tibb Universitetinin Oftalmologiya kafedrasının müdiri, professor, şair Paşa Qəlbinur çıxış etdilər. Millət vəkili Hüseynbala Mirələmov akademik Zərifə xanım Əliyevaya həsr etdiyi "Zərifə Əliyeva" kitabı haqqında tədbir iştirakçılarını məlumatlandırdı, onu əsl ziyalı, görkəmli alim, nəcib, həssas ürəkli bir insan kimi səciyyələndirdi.

Professor Paşa Qəlbinur isə akademik Zərifə xanım Əliyevanı yüksək intellekt səviyyəsinə, dərin biliyə, hərtərəfli istedada malik bir alim, eyni zamanda daim insanlara kömək göstərmək amalı ilə yaşayan həssas bir insan kimi xarakterizə etdi.

**Mənsur İBRAHİMLİ**

# Ulu öndər Heydər Əliyevin 90 illik yubileyinə həsr edilmiş spartakiada




Aprel ayının 17-də ADPU-da ümummilli lider Heydər Əliyevin 90 illik yubileyinə həsr edilmiş spartakiadanın açılış mərasimi keçirilib. Açılış mərasimi ulu öndər Heydər Əliyevin universitetdəki abidəsi önündən başlanıb. Mərasim iştirakçıları ulu öndər Heydər Əliyevin abidəsi önünə gül dəstələri qoymuş, xatirəsinə ehtiramlarını bildirmişlər.

Mərasimi giriş sözü ilə ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, professor Yusif Məmmədov açaraq bildirmişdir ki, Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyev bu il yanvar ayının 21-də xalqımızın ümummilli lideri Heydər Əliyevin 90 illik yubileyinin dövlət səviyyəsində geniş miqyasda keçirilməsi haqqında sərəncam imzalamışdır. Bu sərəncama uyğun olaraq ADPU-da da Ulu Öndərin 90 illik yubileyi münasibətilə müxtəlif silsilə tədbirlərin keçirilməsinə başlanılmışdır. Bu gün keçirilən spartakiada da həmin silsilə tədbirlərdən biridir. Spartakiada idmanın 4 növü üzrə - voleybol, şahmat, dama və nərd üzrə keçirilir. Yarışlar bir həftə davam edəcək. Qaliblər respublikamızın ali məktəb tələbələri arasında keçirilən respublika birinciliyində iştirak etmək hüququ qazanacaqlar. Rektor Y.Məmmədov çıxışının sonunda yarış iştirakçılarına uğurlar arzulamışdır. Sonra tədbir universitetin idman zalında voleybol komandaları arasında keçirilən oyunla davam etmişdir. Onu da qeyd edək ki, bu yarış Təhsil Nazirliyi və Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqı Respublika Komitəsinin birgə qərarı əsasında keçirilir.

**Könül MƏMMƏDOVA,**
**Tarix fakültəsinin I kursunun 103-cü qrup tələbəsi**






# Qazi Universitetinin professoru Alev Çakmakoğlu Kuruya ADPU-nun fəxri doktoru diplomu təqdim edilib

Aprel ayının 16-da Türkiyə Respublikasının Qazi Universitetinin nümayəndə heyəti Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) olmuşdur. Qonaqlar və ADPU-nun rəhbərliyi əvvəlcə Fəxri Xiyabanda ümummilli lider Heydər Əliyevin məzarını ziyarət etmiş, məzarı önünə gül dəstələri düzmüşlər. Xalqımızın görkəmli oftalmoloq alimi, akademik Zərifə Əliyevanın da xatirəsi ehtiramla yad edilmişdir. Qonaqlar və ADPU-nun rəhbərliyi həmçinin Şəhidlər Xiyabanında Azərbaycanın ərazi bütövlüyü və dövlət müstəqilliyi uğrunda şəhid olmuş soydaşlarımızın məzarlarını, eləcə də qəhrəman Türk əsgərinin məzarını ziyarət etmişlər. Sonra ADPU-nun Elmi Şurasında Qazi Universitetinin professoru Alev Çakmakoğlu Kuruya universitetin fəxri doktoru diplomu təqdim edilmişdir.

Məlumat üçün qeyd edək ki, səmərəli elmi-pedaqoji fəaliyyətinə, eyni zamanda Türkiyə ilə Azərbaycan arasında elmi-mədəni sahədə əlaqələrin inkişafında və qəsbkar ermənilərin Azərbaycan torpaqlarında törətdikləri faciələr haqqında məlumatların dünya ictimaiyyətinə çatdırılmasındakı müstəsna xidmətlərinə görə Qazi Universitetinin professoru Alev Çakmakoğlu Kuruya ADPU-nun fəxri doktoru diplomunun verilməsi haqqında qərar universitetin Elmi Şurasının bu il aprel ayının 15-də keçirilən iclasında qəbul edilmişdir.





Təqdimat mərasimini ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov açmışdır. Rektor Y.Məmmədov öz çıxışında Azərbaycan ilə Türkiyənin tarixi birliyindən danışmış, ulu öndər Heydər Əliyevin "Biz bir millət, iki dövlətik", böyük tarixi şəxsiyyət Mustafa Kamal Atatürkün "Azərbaycanın sevinci sevincimiz, kədəri kədərimizdir" kəlamlarını xatırlatmışdır. Rektor Y.Məmmədov xanım Alev Çakmakoğlu Kurunun Azərbaycan həqiqətlərinin təbliğində böyük xidmətlər göstərdiyini xüsusi qeyd etmişdir. Sonra fəxri doktor diplomu xanım Alev Çakmakoğlu Kuruya təqdim edilmişdir. Xanım Alev Çakmakoğlu Kuru universitetin fəxri doktorlar qeyd kitabına imza atmışdır.

Tədbirdə iştirak edən millət vəkili Qənirə Paşayeva Azərbaycan-Türkiyə əlaqələrinin bütün sahələrdə, o cümlədən təhsil sahəsində yüksək səviyyədə inkişaf etməsindən böyük razılıqla danışmış, xanım Alev Çakmakoğlu Kurunu fəxri ada layiq görülməsi münasibətilə təbrik etmiş, ona möhkəm cansağlığı, elmi-pedaqoji və ictimai fəaliyyətində uğurlar arzulamışdır.

Xanım Alev Çakmakoğlu Kuru öz növbəsində Türkiyə ilə Azərbaycanın mehriban dostluq və qardaşlıq münasibətlərindən danışmış, ADPU-nun fəxri doktoru adına layiq görülməsindən məmnunluq duyduğunu ifadə etmiş, universitein rəhbərliyinə və kollektivinə öz dərin təşəkkürünü və xoş arzularını bildirmişdir.

**Mənsur İBRAHİMLİ**

# Ulu öndər Heydər Əliyevlə ilk və son görüş



1990-cı il dekabrın 23-də mən Naxçıvana getdim. Bu vaxt mən Bakı şəhərinin Rəsulzadə qəsəbəsindən Bakı Şəhər Xalq Deputatları Sovetinə deputat seçilmişdim. Mənim namizədliyimi qaçqınlar cəmiyyəti irəli sürmüşdü. Sənədlərimi Ali Sovetə deputat seçilmək üçün də vermişdim.

Naxçıvana getməyimin səbəbi o idi ki, dünya siyasətçisi Heydər Əliyevdən məsləhət alım. Siyasətçilərin, ziyalıların nə edəcəyini ondan öyrənim. Azərbaycan hər bir cəhətdən ağır vəziyyətdə idi. Mən ora bacım oğlu, qızımın həyat yoldaşı Əli Nağıyevlə (hazırda Baş prokuror yanında Korrupsiyaya Qarşı Mübarizə İdarəsinin rəis müavini, general-mayor) getmişdim. O, məni qorumaq üçün getmişdi.

Həftənin altıncı günü idi. Biz ora çatanda iş vaxtı qurtarmışdı. Görüşmək mümkün deyildi. Bir nəfər onu yaxşı tanıyan adamdan (Fərruxdan) xəbər göndərdim ki, Bakıdan bir nəfər ziyalı gəlib Sizinlə görüşmək istəyir. Fərrux cavab verdi ki, artıq gecdir, sabah da istirahət günüdür. O, nə vaxt sizinlə görüşə bilər? Heydər Əliyev gecə cavab verir ki, bir haldakı Bakıdan mənim yanıma gəlibdir, qoy elə sabah 11-də gəlsin qaldığım evə.

Mən ora gedəndə 2 nəfər adam - 1 qadın, 1 kişi onun yanında idilər. 2 nəfər də qəbulundan çıxıb getməyə hazırlaşırdı. Bunlardan 2-si Sumqayıtdan, 2-si də Ağdamdan idi. Nəhayət, 12-yə 5 dəqiqə işləmiş məni qəbul etdi. Təxminən 10 dəqiqədən sonra (Vasif Talıbovun evi idi. 2 mərtəbəli, 2 otaqlı ev idi. Soyuq idi. Bir xırda elektrik peçi qoyulmuşdu. O da yaxşı qızdırmırdı) məndən soruşdu ki, Bakıya nə vaxt qayıdacaqsan? Dedim ki, saat 5-ə biletim var. Evdəkilərə dedi ki, bu gün mənim yanıma daha adam buraxmayın, sabah gələrlər.

Bundan sonra o məndən Bakıdakı vəziyyəti soruşdu. Mən Bakı şəhərində və başqa bölgələrimizdə olan vəziyyət haqqında ona ətraflı məlumat verdim. Müxtəlif səpkilərdə çox söhbətlərimiz oldu. Bunların hamısını burada yox, Heydər Əliyevlə bağlı xatirələrimdə deməyi, yazmağı planlaşdırmışam. Burada onun mənə verdiyi məsləhətlərdən bəzilərini qeyd etməklə kifayətlənəcəyəm.

Onun verdiyi məsləhətlərdən:

1. Azərbaycan informasiya blokadasındadır. İnformasiya blokadasını yarmaq lazımdı. Ziyalıları səfərbər edin. Qorxmasınlar. Xarici qəzet və jurnallarda vəziyyəti işıqlandırsınlar. İmkanı olanlar xarici radio və tetevizorlarda çıxış etsinlər. Ermənilərin təbliğatını alt-üst etmək lazımdır.

2. Xalqın hamısını birləşməyə çağırın. Ziyalı da, vəzifəli də, vəzifəsiz də birləşməli və sözləri bir olmalıdır. Başqa yol yoxdur.

3. Azərbaycanda yaşayan bütün xalqlara hörmətlə yanaşın. Onları incitməyin, küsdürməyin, başqa ölkələrə getməyə qoymayın. Qoy onlar və onların xarici ölkələrdəki dostları, yaxınları, dövlətləri sizə kömək etsinlər.

4. Din xadimlərini səfərbərliyə alın. Qoy onlar müsəlman ölkələri ilə əlaqələri gücləndirsinlər.

5. Ali Sovetə vətənpərvər ziyalıları, nüfuzlu adamları seçin.

Xeyli söhbətdən sonra o, məndən soruşdu ki, Bakıda yaşayanlar yayda hara istirahətə gedir? Bakıda yaşayan adamların bir çoxu rayonlardan gəlib orada məskunlaşıblar. Onlar yayda öz rayonlarına gedə bilirlərmi?

Mən cavab verdim ki, bağlarda da, rayonlarda da dincələnlər var. Lakin bunlar kifayət etmir. Yaylaq yerlərimizin bir hissəsi ermənilərdədir. Şimali Qafqazda da ermənilər çoxdur. Camaat ora getməyə qorxur. Bu cəhətdən vəziyyət bir qədər çətindir. Nə edək, dözməliyik.

O, təəssüf edə-edə dedi: Mən Moskvada olanda Xəzər ətrafının böyük bir hissəsini sanatoriya, istirahət zonası etmək istəyirdim. Buna icazə də almışdım. İstəyirdim ki, Azərbaycan turist ölkəsi kimi, istirahət mərkəzi kimi tanınsın. Bu zaman hamı işlə təmin olunacaq, həm də yaxşı yaşayacaq idi. Lakin Qorbaçov buna mane oldu. Bu işi başlamağa imkan vermədi. Tək-tək bağ evi düzəltmək də, problemi həll etmirdi.

Bundan başqa, o zaman Bakıda yaşayan azərbaycanlıların böyük bir hissəsi zirzəmilərdə, nəmin, suyun içərisində yaşayırdı. Yaxşı mərtəbələrdə, isə əsasən, ermənilər məskunlaşmışdı. Səmentin çoxunu da bağ tikintisinə daşıyırdılar. Mən mikrorayonlar salıb zirzəmilərdə əziyyət çəkən azərbaycanlıları xilas etməli idim. Əgər məsələyə bir balaca göz yumsaydım, Əhmədli kimi sahəni tikib Bakı sakinlərinə verə bilməzdim. Eləcə də digər mikrorayonları...

Sonra o məndən soruşdu: filoloqsan, hal-hazırda hansı mövzulardan yazırsan? Mən cavab verdim ki, fel bəhsini araşdırıram. O, mənə dedi ki, yaxşı mövzudur. Dilimizin qədimliyini isbat edən mövzudur. Lakin hal-hazırda ondan da vacib bir mövzu var. Ermənilər Ermənistan Respublikasında yaşayan azərbaycanlıların hamısını öz doğma yurdundan çıxartmışlar və oradakı yer-yurd adlarını da sürətlə dəyişirlər. Bu yer-yurd adlarını Sizin nəsil yazmasa, itib-batacaq və gələcək nəslə çatmayacaqdır. Bu yer-yurdların azərbaycanlılara məxsus olduğunu yazıb beynəlxalq aləmə yaymaq lazımdır. Tarixçi alimlər də ermənilərin törətdiyi cinayətləri, soyqırımı, deportasiyanı yazıb yaymalıdırlar.

Mən Bakıya qayıdan kimi kafedra əməkdaşlarını yığıb bu tövsiyəni onlara çatdırdım. Zəngəzur bölgəsinin tədqiqini professor Vilayət Əliyevə, Göyçə bölgəsini dosent İbrahim Bayramova, Ağbaba bölgəsini dosent Aslan Bayramova həvalə etdim. Dərələyəz bölgəsini tədqiq etməyi də öz üzərimə götürdüm. Nəticədə bu bölgələrin toponimləri adlarını çəkdiyim müəlliflər tərəfindən əsasən tədqiq edildi, bunlara aid kitab və məqalələr nəşr olundu.

Söhbət zamanı o bir məsələnin üzərində ciddi dayandı və dedi:

Xalq Cəbhəsinin sədri Əbülfəz Elçibəy mənə zəng edib dedi ki, Naxçıvan Ali Məclisi çox yaxşı qərarlar qəbul edib və onları «Sovetskaya Naxçvan» və «Şərq qapısı» qəzetlərində çap edibdir. O qəzetlərdən bir xeyli göndərin Bakıya, biz onları kütləyə çatdıraq. Biz də o qəzetlərdən 800 ədəd yığıb göndəririk. Lakin yayıb-yaymadıqlarından xəbər yoxdur. Sən bu qəzetləri orada görmüsənmi? Mən bu haqda məlumatın olmadığını dedim.

O, izah edib dedi ki, biz Dağlıq Qarabağ, Şaumyan rayonu və Xanlar rayonunun Çaykənd kəndi haqqında, Bakıdakı fövqəladə vəziyyət haqqında, 20 Yanvar hadisəsinə siyasi qiymət verilməsi haqqında və bir çox məsələlər haqqında ciddi, lazımlı qərarlar qəbul etmişik. Belə çıxır ki, bu qəzetləri onlar xalqa çatdırmayıblar. Əgər çatdırsaydılar, səs-sorağı çıxardı. Sən buradan gedən kimi, Əbülfəz Əliyevin yanına get və mənim adımdan ondan soruş ki, qəzetlər yayılıb, ya yox. Sonra da həmin qəzetlərin hər birindən 5 ədəd və bir jurnal mənə verdi.

Mən dedim ki, əgər onlar həmin qəzetləri paylamayıbsa, onda icazə verin biz bunların surətini çıxarıb xalqa çatdıraq. O, buna razılıq verdi. Mən Bakıya gələn kimi Əbülfəz Elçibəyin yanına getdim və ümummilli liderimiz Heydər Əliyevin tapşırığını ona çatdırdım. O, mənə dedi ki, mən göstəriş vermişəm paylasınlar. Bu saat öyrənib sənə deyərəm. O, idarə heyətini otağına yığdı. Məni içəridə oturmağa qoymadılar. Çıxıb qapının yanında dayandım. İçəridə ciddi söhbət getdi. İsa Qəmbər ona dedi ki, mən qoymamışam paylasınlar. Biz bunu paylasaq, hörmətdən düşərik. Bura mərkəzdir, Naxçıvan isə əyalət. Biz partiyanın geniş yığıncağını çağıraq. Onlar razı olsalar, yayarıq. Rəhim Qazıyev İsa Qəmbəri müdafiə etdi, hay-küy saldı... və həmin qəzetlər xalq kütləsinə çatdırılmadı. Qəzetləri kütlələrlə yaymadılar.

Bundan sonra mən Azərbaycan Dövlət Pedaqoji Universitetinin dosenti, Tarix fakültəsinin dekanı dosent Rəhim Əliyevin, texnikumun direktoru Firidun Qurbanovun və Əli Nağıyevin köməkliyi ilə bunların surətlərini çıxarıb Bakı, Sumqayıt şəhərlərində, Tərtər və Şəmkir rayonlarında yaya bildik.

Görüş zamanındakı bir məqamı da burada qeyd etmək istəyirəm.

Söhbətimizin son anları idi. Cənab Heydər Əliyev ayağa durub o biri otağa keçdi və məcməyi əlində biz oturan stola yaxınlaşdı. Məcməyinin içində pendir-lavaş və müxtəlif formalarda bişirilmiş şirin çörəklər, kökələr... var idi. Mənə dedi ki, söhbətə başımız qarışdı, yemək yadımızdan çıxdı. İndi sən yaxşı-yaxşı yeməlisən. Mən utana-utana dedim ki, çox sağ olun, acmamışam, yemirəm. Mənim üzümə baxıb dedi: sən Naxçıvandan ac getmək istəyirsən?! Sonra lavaşın arasma bir az pendir qoyub yedi. Bundan sonra da şirin çörəklərdən əlinə götürüb dedi: sən bu şirin çörəklərin bir dadına bax! Bunları Naxçıvanda daha yaxşı bişirirlər. Nə bilirsən təyyarən Bakıya nə vaxt çatacaq? Bu qədər müddəti ac qalmaq olmaz! Mübarizə üçün həm də sağlam olmalısınız. O gülə-gülə, incə yumorları ilə məni danışdırır və məni stolun üstündəki şirin çörəklərdən bir-bir dadmağa məcbur edirdi. Bir azdan gördüm ki, stoldakı yeməklərin bir hissəsini yemişəm.

Bu məqam heç vaxt mənim yadımdan çıxmır. O böyüklükdə, o zəhimdə olan dahi nə qədər sadə, nə qədər qayğıkeş, nə qədər mülayim idi. Planetin bir nömrəli siyasətçisi, dünya siyasətçilərinin öndəri, təkrarsız şəxsiyyət, ümummilli lider Heydər Əliyevin xarakterindəki bu cəhət bəlkə də çoxlarına məlum deyil...

Heydər Əliyev Azərbaycan uğrunda, Azərbaycan yolunda şəhid oldu. Heydər Əliyevin itkisi yalnız Azərbaycanın deyil, həm də dünyanın itkisidir, dünya siyasətinin itkisidir. O, hal-hazırda bizim aramızda olmasa da, mənən bizimlədir, qurub-yaradan insanların arasındadır. O, dünya durduqca duracaq, insanlar yaşadıqca yaşayacaqdır, çünki Heydər Əliyev dünyanın ən müdrik ağsaqqalı, ən müdrik siyasətçisidir. Heydər Əliyev siyasət aləminin günəşi, müdrikliyin zirvəsidir. Heydər Əliyev siyasətin allahı, dövlətçiliyin mayakıdır. Heydər Əliyev dünya siyasətinin hansı istiqamətdə gedəcəyini əvvəlcədən dəqiq proqnozlaşdıran bir şəxsiyyət olmuşdur. Heydər Əliyev dünya tarixində daim yaşayacaq təkrarsız fenomendir. Siyasət aləmində, dövlətçilik işində və digər sahələrdə onun qədər hərtərəfli biliyə, intellektual səviyyəyə, yaddaşa malik olan ikinci bir adam tanımıram. O, öz işi və əməli ilə qəlblərdə özünə heykəl qoymuşdur. Heydər Əliyev Azərbaycanın xilaskarı, qurucusu, memarı və milli lideridir.

Azərbaycanda 20 Yanvar qırğınını ilk dəfə dünyaya yayan, 20 Yanvar və Dağlıq Qarabağ hadisələrinə ilk siyasi qiymət verən, Naxçıvandan rus ordusunu çıxaran, Türkiyə ilə Qars müqaviləsini təzələyən, Azərbaycanın 4 yerə parçalanmasının, vətəndaş müharibəsinin, qardaş qırğınının qarşısını alan, deportasiya. soyqırımı haqqında ilk fərman verən, xarici ölkələrdə informasiya blokadasını yaran, Azərbaycan lobbisini, GUAM-ı yaradan, böyük neft kontraktlarını bağlayan, Bakı-Ceyhan kimi nəhəng kəmərin çəkilməsinə nail olan, böyük sarayları, körpüləri, elektrik stansiyalarını tikdirən, sərkərdələrə, şairlərə, yazıçılara, mədəniyyət işçilərinə ad verən, heykəllər ucaldan, bir sözlə, Azərbaycanın müstəqilliyini, suverenliyini qoruyub saxlayan məhz Heydər Əliyev olmuşdur. Heydər Əliyev suverenliyimiz, müstəqilliyimiz uğrunda ömrünü gilə-gilə əridən, ürəklərdə, könüllərdə, qəlblərdə özünə əbədi heykəl qoyan rəhbər kimi qüdrətli, ədalətli, dəyanətli dövlət başçısı kimi yenilməz, məğlubedilməz, təkrarolunmaz sərkərdə kimi, sülhsevər, vətənpərvər, insanpərvər ali baş komandan kimi daim tarixdə və qəlblərdə yaşayacaqdır. Dünya ictimaiyyətinin gözündə Məhəmməd Peyğəmbərdən sonra ən yüksək yerlərdən birini o tutacaqdır.

**Həsən Mirzəyev,**
**ADPU-nun Müasir Azərbaycan dili kafedrasının müdiri,**
**Əməkdar elm xadimi,**
**professor, "Şöhrət" ordenli,**
**Prezident təqaüdçüsü**

***Redaksiyadan:*** ***Ümummilli lider Heydər Əliyevin 90 illik yubileyi münasibətilə redaksiyamıza universitetimizin əməkdaşları tərəfindən çoxlu sayda yazılar daxil olub. Onları qəzetimizin növbəti saylarında dərc edəcəyik.***

# VƏTƏN SEVGİSİ

## Unudulmaz müəllimim, akademik Zərifə xanım Əliyevanın əziz xatirəsinə

**ANA! Öz tutumuyla bu varlıqla müqayisə olunası iki ruhi-müqəddəs tanıyıram: çörək, Qurani-Kərim.**

Bu sözün - varlığın bütün canlılarda, gücü, anlamı eynidir. Balaövlad yolunda, dünyaya gətirdiyinin yolunda həyatından belə keçmək qüdrəti. Mütləq məhəbbətin bir nümunəsi. Gəlin etiraf edək ki, bu qan yaddaşından gələn məhəbbətin də dərəcələri olur, belə deyək ki, daha böyükləri, nəhəngləri olur. Və bu nəhəng hisslər, sevgilər zərif analarımızın qəlbində olur. Analar övladlarını laylalarla, bayatılarla oxşayırlar. Övladlar analarını Cəfər Cabbarlının "Ana" şeiriylə...

Zərifə xanım haqqında bir Ana kimi danışanda öz müşahidələrimdən başqa, xatirəsi həmişə mənə əziz olan iki gözəl insanın - müəllimələrim olmuş professor Zəhra xanım Quliyevanın və dosent Ləzifə xanım Əliyevanın (Ləzifə xanım Zərifə xanımın böyük bacısı idi) sözləri yadıma düşür. Onlar danışırdılar ki, Zərifə xanım övladlarına fanatik məhəbbətli bir Ana idi. İşdə müxtəlif otaqlardakı telefonlardan (çox nəzərə çarpmasın deyə) saysız dəfələr zəng edib evdə qoyub gəldiyi ciyərparələrini soruşardı. Və bu telefon danışıqlarından yalnız birini dinləyən adam heç vaxt onu unutmaz, bir ananın övladlarına olan məhəbbətinin ifadəsini ömrü boyu özüylə gəzdirərdi...

Onun həyat yoldaşı - o zamanlar Azərbaycan KPMK-nın birinci katibi Heydər Əlirza oğluna olan münasibətindən bir anın şahidi olmuşdum: Ləzifə xanımgildə balaca nəvəsi Eminin ad günündə (anam İldız xanımla mən də orada idim) dünənki televiziya ilə verilən iclasda Heydər Əlirza oğlunun böyük çıxışından söhbət düşəndə Zərifə xanımın gözlərini, üzünün ifadəsini heç zaman unutmaram. Bircə onu dedi ki, mən nəfəsimi dərmədən bütün çıxışı dinlədim, heyran olmuşdum.

Zərifə xanım yeri gələndə çox incə yumorla danışardı. Gülarə xanım da doğmaları, çox yaxınları ilə şux zarafatlar edərdi. O məclisdə Ləzifə xanım azca soyuqlamışdı, Gülarə xanım bunu görcək gülə-gülə dedi ki, Ləzi bacı (o, Ləzifə xanımı mehribancasına belə çağırardı) eybi yoxdu keçib gedəcək, təki xəstələnək, ancaq ölməyək. Zərifə xanımın zərif, olduqca yerində olan yumorundan Zəhra xanım, Ləzifə xanım, kafedramızın onunla həmyaş olan dosentləri Səkinə xanım, Rəfiqə xanım saatlarla gözəl xatirələr danışardılar. Səkinə xanım və Rəfiqə xanım indi də danışırlar. İncə, zərif, yerinə düşən yumor, yüksək zövq sahiblərinə, geniş dünyagörüşünə əsilzadələrə məxsus əlamətdir və çox təəssüf ki, bu dünyada bütün yaranmışlara nəsib olan xoşbəxtlik deyil. Bu səadət Zərifə xanımın saysız bəzəklərindən, tale vergilərindən biriydi.

Allah-Taala onu valideynlərindən də yarıtmışdı. Dünyanın ən gözəl kişilərindən biri, xeyirxahlarından biri, alimlərindən biri, siyasi xadimlərindən biri, ləyaqət sahiblərindən, seçilmişlərindən, tanınmışlarından biri, varlığıyla Azərbaycanın tarixi bir mərhələsi olan Əziz Əliyevin ailəsində dünyaya gəlmişdi Zərifə xanım. Anası Leyli xanım xanımlar xanımı, ağlı zəkası bir dünyanı idarə edəcək bir güc, nur idi. Leyli xanımın da söhbətləri heç vaxt unudulmayacaq gözəllikdə idi. O söhbətlərdən bir epizodu, bir yarpağı xatırladım. Leyli xanım danışırdı ki, həyat yoldaşı Əziz müəllim uzun müddət Vətəndən uzaqda işləyirmiş. O vaxt uşaqların böyüyü Ləzifənin (Leyli xanımın dilindən deyirəm) əlindən tutub Mircəfərin (Mircəfər Bağırov) qəbuluna getdim, xahiş elədim ki, Əzizi Azərbaycana qaytarsın, nə iş verir, versin, lap adi iş olsun. O da qayıtdı ki: Leyli xanım, Əziz Azərbaycana gəlsə o heç bir, işdə işləyə bilməz, onu layiq olan yer ancaq mənim yerimdir, onu da mən tutmuşam. Bunu deyib bir xeyli susdu. Mən də gözləmədiyim cavabdan sonra heç bilmədim nə deyəm, sağollaşıb gəldim evimizə.

Zərifə xanımın böyük qardaşı professor Tamerlan Əziz oğlu Əliyev Tibb Universitetində Terapiya kafedrasının müdiri idi. Ürəyimdə bir kitablıq söz, məhəbbət var onun ünvanına. İnşallah ömür vəfa eləsə yazacağam. Ancaq bircə onu deyim ki, bu yaşıma qədər doğmalarım, dostlarım, müəllimlərim qarışıq lap yaxından tanıdığım müqəddəslərimin bir siyahısı var ürəyimdə. Mən Allahımı heç vaxt unutmaram, ancaq o adamların Tanrı dərgahındakı hörmətlərinə güvənib dara düşəndə yalnız ürəyimdə pıçıltıyla Allahdan sonra köməyimə çağırıram. O kiçik siyahıda Hüseyn babam var. Var olanlardan biri də Tamerlan müəllimdir. Böyük, çox böyük ləyaqət sahibi, nur daşıyıcısı professor Tamerlan Əziz oğlu Əliyev! Mənim üçün həmişə canlı olan müqəddəs İnsan!

Bu böyük ailənin, nəsil-şəcərənin Zərifə xanımla bağlı hər bir üzvü Dilbər xanım, akademik Cəmil Əliyev haqqında saatlarla danışmaq imkanım var. Ancaq bu xatirə yazının qəbul olunmuş reqlamentinə uyğunlaşmalıyam.

Bir ailənin iki üzvü - olduqca böyük şəxsiyyətlərdən dünyaya gələn övladların genetik varisliyi valideynlərin və övladların böyük xoşbəxtliyidir.

Sevil xanımın qeyri-adi çoxşaxəli istedadı, savadı, təvazökarlığı, mədəniyyətinin bu səviyyədə olmasında atasının və Zərifə xanımın müstəsna rolu olmuşdur. Uzun illər bundan əvvəl Zərifə xanım anamın arasında olan bir söhbəti heç cürə unuda bilmirəm. O söhbət Ləzifə xanımgilin evində Ləzifə xanım, qızı Svetlana xanım, Gülarə xanımın yanında olmuşdu. Zərifə xanım deyirdi ki, Sevil (mənim yaddaşımda o vaxtlar Sevilin 16-17 yaşı olardı) bir tikə çörəyi (arasında pendir) qalanda belə atmır, tullamır, bükük qoyur ki, sonra yeyərəm. Atası ölkənin birinci yox, lap yüzüncü adamı olan qız ya oğlan uşağından bu cür nümunə, hətta deyərdim ki, müqəddəs davranış nadir hadisəydi, lap elə indinin özündə də heyrət və qibtə doğurardı...

Zərifə xanım alim idi. Adı böyük hərflərlə yazılan ALİM. Zamanı qabaqlayan. Onun bir neçə istiqamətdə apardığı işlər illər keçəndən sonra daha da aktuallaşır, gərəkli olur, qiyməti daha da artır. Məsələn, gözün peşə xəstəlikləri ilə əlaqədar Sovetlər Birliyində yaradılan ilk sanballı elmi laboratoriya. Onun rəhbərlik etdiyi, böyük ideyaları reallaşdıran bu kollektivin gördüyü işlərin elmi nəticələri bütün dünyada qəbul olunurdu. Əslində, akademik Zərifə xanım Əliyeva dünyada bu elmi istiqamətin pioneridir. Heç də təsadüfi deyil ki, o, SSRİ Tibb Elmləri Akademiyasının yüksək Averbax mükafatına layiq görülmüşdü. Akademik Zərifə xanım Əliyevanın məşğul olduğu elmi istiqamətlərdən biri də iridodiaqnostikaya həsr olunan ilk elmi monoqrafiyanın aparıcı müəlliflərindən olması idi.

Professor Zərifə xanım Əliyeva bu günü uzun illər əvvəl görüb, tibbi deontologiyaya aid qiymətli elmi-fəlsəfi əsərlər yazıb mərkəzi mətbuatda çap etdirirdi.

O, Moskvada nəşr olunan və o zamankı Sovetlər Birliyinin ən nüfuzlu oftamoloji elmi dərgisi olan "Vestnik oftalmoloqiy" jurnalının redaksiya heyətinin üzvü idi. Həmin jurnalın baş redaktoru Ümumittifaq Göz Xəstəlikləri İnstitutunun direktoru akademik M.M.Krasnov idi. Həmin illərdə mən bu elm ocağında aspiranturada, sonra isə doktoranturada təhsil alırdım. Zərifə xanımla vaxtaşırı həmin elmi mərkəzdə, müxtəlif elmi toplantılarda, ya da jurnalın redaksiya heyətinin yığıncaqlarına gələndə görüşərdik. Bu qısa görüşlərdə o həmişə çox səmimi olardı, qayğılarımla maraqlanırdı.

Bir dəfə mənə dedi ki, Heydər Əliyev də sənin boyartımını izləyir, uğurların haqqında bizim evimizdə söhbətlər olur. Mən bir az utanaraq ona və Heydər Əlirza oğluna təşəkkür etdim. Bir müddət sonra Ümumittifaq Göz Xəstəlikləri İnstitutunun təqdimatı ilə elm sahəsində Ümumittifaq Lenin komsomolu mükafatına layiq görüləndə Heydər Əlirza oğlu məni Moskvadan Bakıya telefon zəngi ilə şəxsən təbrik etdi.

Heydər Əlirza oğlu sonralar illər keçəndən sonra mənfur Qorbaçovun həsədinə tuş gəlib Bakıya dönüşündə, (yerli hakimiyyətlə də müxalif mövqedə olanda), Filarmoniyada yazıçıların qurultayında təsadüfən mənə yaxın oturacaqda əyləşdi. Xəlil Rzayla birgə idilər. Görüşdük. Fasilədə həmin zəngə görə bir daha təşəkkür etdim. Və bir də dedim ki, Siz Moskvadan məni təbrik etdiniz, ancaq burada Kamran Bağırov heç elə bil ki, yoxuymuş. Gülümsündü: "Fikir vermə, hamı bir olmaz ki" - dedi.




Akademik Zərifə xanım Əliyevanın elmi-pedaqoji, ictimai fəaliyyəti haqqında yazılanlardan fərqli qısaca öz müşahidələrimi qələmə aldım. O, bir övlad kimi, bir evin, bir kişinin xanımı kimi, bir ana kimi, alim, müəllim, vətəndaş kimi, həmişə ucalardan ucadaydı. Elmi konfranslardan sonrakı toplantılarda, ya bayramlarda, ad günlərində əksər hallarda unudulmaz Gülarə xanım da iştirak edərdi, həmişə birinci mahnı sifarişi "Anamın anasısan Azərbaycan" olardı. "Ana" və "Azərbaycan" sözlərini heç kim onun kimi tələffüz elə bilməzdi.

Akademik Zərifə xanım Əliyeva Prezident xanımı, Prezidentin Anasıdır. Bu onun taleyi idi. Böyük, olduqca böyük həssaslıqla duymaq, görmək, heyran olmaq, zəhməti sevmək, insanları, Vətəni sevmək onun böyük istedadı idi.

Böyük sevgidən yaranıb, böyük məhəbbətlə insanları, Vətəni sevənlər əbədi yaşayanlardır...

**Paşa Qəlbinur,**
**Azərbaycan Tibb Universitetinin Oftalmologiya kafedrasının müdiri, professor**

# Ümummilli lider Heydər Əliyevin 90 illik yubileyinə həsr olunmuş bədii yaradıcılıq festivalı



May ayının 10-da xalqımızın dahi oğlu, müstəqil Azərbaycan dövlətinin banisi və qurucusu, ümummilli lider Heydər Əliyevin anadan olmasının 90 ili tamam olur. Ulu öndərimiz Heydər Əliyevin bu əlamətdar tarixi yubileyi münasibətilə ölkəmizdə və dünyanın bir çox xarici ölkələrində müxtəlif tədbirlər həyata keçirilir. Bir faktı xüsusi qeyd etmək yerinə düşər ki, dahi öndər Heydər Əliyev xalqımızın yüksək milli-mənəvi dəyərlərinin qorunmasına və bu dəyərlərin təbliğ edilməsinin dövlət siyasətinin əsas istiqamətlərindən birinə çevrilməsində böyük rol oynamışdır. Təhsil Nazirliyi və Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqı Respublika Komitəsi bu il fevral ayının 6-da ümummilli lider Heydər Əliyevin 90 illik yubileyi münasibətilə respublikamızın ali məktəb tələbələri arasında bədii yaradıcılıq festivalı keçirmək haqqında birgə qərar vermişlər.

Bu bədii yaradıcılıq festivalının keçirilməsində əsas məqsəd tələbəgəncləri vətənpərvərlik, adət-ənənələrimizə, mədəniyyətimizə, incəsənətimizə hörmət ruhunda tərbiyə etmək və eyni zamanda onların incəsənət sahəsindəki istedadlarını üzə çıxararaq inkişaf etdirməkdir. Festivalın keçirilməsi üçün Təşkilat Komitəsi və xalqımızın tanınmış sənət xadimlərindən ibarət Münsiflər Heyəti yaradılmışdır.

Mart ayından başlayaraq keçirilən festivalda ölkəmizin bütün dövlət və qeyri-dövlət ali məktəblərinin tələbələri iştirak edirlər. Aprel ayının 9-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) adıçəkilən bədii yaradıcılıq festivalının seçim turu keçirilmişdir. Seçim turunda ADPU-nun, Azərbaycan Texniki Universitetinin və Azərbaycan Memarlıq və İnşaat Universitetinin 120-dən çox tələbəsi iştirak etmişdir. Onu da qeyd edək ki, festival qaliblərinin yekun konsertinin bu il may ayının birinci ongünlüyündə keçirilməsi nəzərdə tutulur.

**Gülnar SÜLEYMANOVA**



# Pedaqogika və psixologiya fakültəsinin ulu öndər Heydər Əliyevin 90 illik yubileyinə həsr etdiyi elmi konfrans



Pedaqogika və psixologiya fakültəsinin müəllim və tələbələri bu elmi konfransa "Ümummilli lider Heydər Əliyevin anadan olmasının 90 illik yubileyinə həsr olunmuş Pedaqogika və psixologiya fakultəsinin müəllim və tələbələrinin elmi konfransının materialları" ilə gəlmişdilər. Məlumat üçün bildirək ki, fakültənin dekanı, dosent Şəhla Əliyevanın rəhbərliyi altında hazırlanmış "Konfrans materialları"nda müxtəlif mövzulara həsr edilmiş 60 məqalə toplanmışdır.

Konfransı giriş sözü ilə fakültənin dekanı, dosent Şəhla Əliyeva açmışdır. Müstəqil Azərbaycan dövlətinin hərtərəfli inkişafı yolunda əvəzsiz tarixi xidmətləri olmuş, milli dövlətçilik ideyasının bərqərar olması və ölkəmizin beynəlxalq aləmdə nüfuzunun artması naminə böyük fədakarlıqla çalışmış ümummilli liderimiz Heydər Əliyevin 90 illik yubileyinin ölkə miqyasında geniş qeyd edildiyini söyləyən dosent Ş.Əliyeva Ulu Öndərin Azərbaycan xalqı, Azərbaycan dövləti üçün etdiklərindən söz açmışdır. Bildirmişdir ki, ana dilimizin dövlət dili kimi tətbiqində, onun imkanlarının genişləndirilməsi və Azərbaycan xalqının ən böyük sərvəti kimi dəyərləndirilməsində Heydər Əliyev şəxsiyyətini rolu danılmazdır. Azərbaycan mədəniyyətinin və zəngin tarixi irsimizin dünya ictimaiyyətinə tanıdılması Heydər Əliyevin misilsiz xidmətlərindəndir. Azərbaycan mədəniyyətinin təbliğinə xidmət edən Məhəmməd Füzulinin 500 illik, "Kitabi-Dədə Qorqud"un 1300 illik yubileylərinin YUNESKO səviyyəsində keçirilməsi beynəlxalq ictimaiyyətlə yeni mədəni əməkdaşlıq formalarının bərqərar olmasına gətirib çıxarmışdır.

Ulu öndər Heydər Əliyevin rəhbərliyi altında milli maraqlara əsaslanan və ölkəmizin siyasi perspektivlərini nəzərə alan xarici siyasət kursu müəyyənləşdirilmiş, dünyanın aparıcı dövlətləri və beynəlxalq təşkilatları ilə qarışılıqlı münasibətlər qurulmuşdur. Onun uğurlu xarici siyasəti ölkəmizin etibarlı tərəfdaş kimi qəbul edilərək beynəlxalq miqyasda nüfuzunun artmasına, islahatçı və təşəbbüskar dövlət olaraq tanınmasına xidmət göstərmişdir. Heydər Əliyevin beynəlxalq aləmdə atdığı qətiyyətli addımlar sayəsində diplomatiyamızın fəal mövqeyi formalaşmış, Azərbaycanın zorla cəlb olunduğu Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ münaqişəsinə dünya ictimaiyyətinin münasibəti dəyişmiş, ölkəmizin suverenliyi, ərazi bütövlüyü və sərhədlərinin toxunulmazlığı bütün beynəlxalq hüquqi-normativ sənədlərdə öz əksini tapmışdır.

Xalqımızın ümummilli lideri Heydər Əliyevin "Mən həmişə fəxr etmişəm, bu gün də fəxr edirəm ki, mən Azərbaycanlıyam!" sözləri dünya azərbaycanlılarının şüarı olmaqla, soydaşlarımızın həmrəyliyinin təməl daşına çevrilmişdir.

Müstəqil Azərbaycan Respublikasına rəhbərlik etdiyi illər ərzində Heydər Əliyev tərəfindən aparılan ardıcıl və məqsədyönlü siyasət nəticəsində Azərbaycan diasporu təşkilatlanmış, inkişaf etmiş, öz tarixi Vətəni Azərbaycanla sıx bağlılıq nümayiş etdirmişdir. Bu gün dünyanın müxtəlif guşələrində yaşayan azərbaycanlıların azərbaycançılıq ideyası ətrafında birləşməsi, müstəqil Azərbaycanı milli ruhun, milli-mənəvi dəyərlərin, milli mədəniyyətin məbədi kimi qəbul etməsi məhz Heydər Əliyevin fəaliyyətinin nəticəsidir.

Dahi Heydər Əliyev şəxsiyyətinin Azərbaycan dövlətçilik tarixində müstəsna yeri vardır. Azərbaycançılıq məfkurəsinin parlaq daşıyıcısı kimi Heydər Əliyev öz müdrik siyasəti, dönməz əqidəsi və tarixi uzaqgörənliyi sayəsində milli dövlətçilik ideyasını gerçəkləşməsinə, xalqımızın müstəqillik arzularına qovuşmasına nail olmuşdur. Məhz Heydər Əliyevin fəaliyyəti nəticəsində Azərbaycan özünün geostrateji, iqtisadi və mədəni potensialından bəhrələnərək Şərqlə Qərb arasında etibarlı körpü rolunu oynamağa başlamış, dünyanın ən dinamik inkişaf edən ölkələrindən birinə çevrilmişdir.



Azərbaycanda müasir, hüquqi, demokratik, dünyəvi dövlət quruculuğu, vətəndaş cəmiyyətinin təşəkkülü, milli-mənəvi dəyərlərə qayıdış və elmin, təhsilin, mədəniyyətin inkişafı əbədi olaraq Heydər Əliyevin adı ilə bağlıdır.

Ölkəmizin Əsas Qanunu olan Konstitusiyanın qəbul edilməsi, hakimiyyətin bölünmə prinsipinin təsbit olunması, hüquq normalarının və qanunvericilik bazasının beynəlxalq standartlara uyğunlaşdırılması, müasir idarəetmə üsullarının bərqərar olması və müvafiq dövlət qurumlarının formalaşdırılması Heydər Əliyevin rəhbərliyi ilə gerçəkləşən genişmiqyaslı quruculuq proqramının tərkib hissələridir.

Azərbaycanın dünya miqyasında neft-qaz hasil və ixrac edən ölkəyə çevrilməsi, milli neft strategiyasının uğurla həyata keçirilməsi, xarici dövlətlərin aparıcı neft şirkətləri ilə müqavilələrin bağlanması, neft sənayesinin müasir tələblərə uyğun infrastukturunun qurulması, neftin Bakı-Tbilisi-Ceyhan, Bakı-Supsa, Bakı-Novorossiysk boru kəmərləri vasitəsilə şaxələnmiş şəkildə nəqli bilavasitə Heydər Əliyevin xidmətidir.

Ulu öndər Heydər Əliyevin respublikamızda ikinci dəfə siyasi hakimiyyətdə olduğu illəri yada salan dosent Ş.Əliyeva Azərbaycanın dünya iqtisadiyyatına uğurla inteqrasiyasını, ölkə daxilində iqtisadi liberallaşmanı, kredit reytinqinin artmasını, iqtisadiyyatımızın rəqabət qabiliyyətinin yüksək səviyyəyə çatmasını, dövlət büdcəsinin və valyuta ehtiyatlarının ildən-ilə çoxalmasını 1993-cü ildən etibarən Heydər Əliyev tərəfindən yeni prinsiplər əsasında qurulan iqtisadiyyatın sabitliyinin bariz nümunəsi olduğunu demişdir.

Heydər Əliyevin Qanlı 20 Yanvar faciəsini Azərbaycan xalqı əleyhinə hərbi, siyasi və mənəvi təcavüz kimi qiymətləndirməsi onun ömrü boyu sadiq qaldığı siyasi məfkurəsinin və yüksək vətənpərvərliyinin yeni siyasi şəraitdə təcəssümü idi.

Mövcud siyasi, iqtisadi və sosial böhran müstəqilliyimizin ilk illərində Azərbaycanı vətəndaş müharibəsi həddinə çatdırdığı bir dövrdə Heydər Əliyevin xalqın təkidli tələbi ilə hakimiyyətə gəldiyi gün - 1993-cü ilin 15 iyunu tariximizə Qurtuluş Günü kimi daxil olmuşdur. Bu Qurtuluş qısa bir zamanda özünü nəinki siyasətdə, həm də iqtisadiyyatda, təhsildə, mədəniyyətdə və insanların gündəlik real həyatında büruzə vermişdir. Bu gün Azərbaycan nüfuzlu vətəndaş cəmiyyətinin qurulduğu, müxtəlif siyasi partiyaların sərbəst fəaliyyət göstərdiyi, yüzlərlə senzurasız qəzet və jurnalların nəşr olunduğu, eləcə də müxtəlif özəl telekanalların yayımlandığı və İnternet şəbəkəsi istifadəçilərinin sayının sürətlə artdığı bir ölkədir.

Heydər Əliyev öz siyasi dühası ilə Azərbaycanın müasir simasını müəyyənləşdirmiş və xalqımızın taleyində silinməz izlər qoymuşdur. Onun siyasəti nəticəsində əldə olunan misilsiz nailiyyətlər göz önündədir. Bu uğurlar paytaxtımızın daim yenilən görkəmində, şəhər və rayonlarımızın sürətlə modernləşməsində, iqtisadiyyat və elmdə, təhsil, mədəniyyət və səhiyyədə, eləcə də ictimai-siyasi həyatımızda öz əksini tapmışdır".

Ulu öndər Heydər Əliyevin ideyalarının onun genetik və siyasi varisi, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev tərəfindən bu gün uğurla davam etdirildiyini söyləyən dosent Ş.Əliyeva demişdir: "Heydər Əliyevin memarı olduğu Azərbaycan bu gün böyük tikinti meydançasını xatırladır. Yüzlərlə sənaye və infrastruktur obyektləri, məktəblər, xəstəxanalar, idman qurğuları, yaşayış evləri, inzibati binalar və digər tikililər ucaldılır, yollar salınır. "Azərbaycan 2020: gələcəyə baxış" İnkişaf Konsepsiyası bizim gələcək planlarımızı əks etdirməklə yanaşı bir daha sübuta yetirir ki, Heydər Əliyevin bu gün ölkəmizin sürətli tərəqqisini təmin edən irimiqyaslı proqramları xalqımızın sosial-istisadi vəziyyətinin daim yaxşılaşmasına xidmət göstərir. Ümummilli lider Heydər Əliyevin Azərbaycan xalqı qarşısında göstərdiyi misilsiz tarixi xidmətlərini xalqımız yüksək qiymətləndirir. Hər il böyük ruh yüksəkliyi ilə keçirilən bu tədbirlər xalqımızın Ulu Öndərə olan məhəbbətinin ifadəsidir. Ümummilli Liderin layiqli davamçısı cənab İlham Əliyevin dəfələrlə qeyd etdiyi kimi, bu gün Azərbaycanda Heydər Əliyev siyasəti uğurla davam etməkdədir. Azərbaycanın inkişafı, yüksəlişi, həyatımızın müsbət şəkildə dəyişməsi əhəmiyyətli dərəcədə Heydər Əliyev tərəfindən müəyyənləşdirilmiş siyasi xəttin reallaşması ilə əlaqədardır.

Heydər Əliyevin ideyaları, siyasəti bu gün də Azərbaycana, Azərbaycan xalqına xidmət edir, xalqımız və dövlətimiz bu gün bu siyasətin həyata keçirilməsinin faydalarını görür".

Tədbirdə həmçinin fakültənin dekan müavini, dosent Allahyar İmanov, Ümumi psixologiya kafedrasının baş müəllimi, fakultə TEC-nin sədri Nailə Hüseynova, Yaş və pedaqoji psixologiya kafedrasının müdiri, professor Ərəstun Baxşəliyev, Məktəbəqədər Təhsilin pedaqogikası və metodikası kafedrasının müəllimi, dosent Şərafət Baxışova çıxış etmiş, Ümumi psixologiya kafedrasının dosenti Tamella Ağayevanın məruzəsi dinlənilmişdir. Tələbələrdən Vüsalə Hüseynovanın ("Məktəbəqədər təlim" ixtisası, 301-ci qrup), Günel Mirzəyevanın ("Korreksiyaedici təlim" ixtisası, 403-cü qrup), Xatirə Məmmədlinin ("Korreksiyaedici təlim" ixtisası, 403-cü qrup), Gülnar Zaxarovanın ("Məktəbəqədər təlim" ixtisası, 202-ci qrup) və Ülviyyə Nəhmətovanın ("Psixologiya" ixtisası, 405-ci qrup) mövzuları rəğbətlə qarşılanmışdır.

Konfransa yekun vuran dosent Ş.Əliyeva mühazirə saatlarından birinin akademik Zərifə Əliyevanın 90 illik yubileyinə həsr ediləcəyini, tələbələrə Zərifə xanımın keçdiyi mənalı həyat yolu, istedadlı həkim, qayğıkeş həyat yoldaşı olması barədə söhbətlər açılacağını söyləmişdir.

Dosent Ş.Əliyeva konfransda iştirak edən hər kəsə minnətdarlığını bildirmiş, konfransın hazırlanmasında Ümumi psixologiya kafedrasının baş müəllimi Nailə Hüseynovanın əməyini xüsusi qeyd etmişdir.

**Ayətxan İSGƏNDƏROV,**
**Lamiyə SOLTANZADƏ,**
**Filologiya fakültəsinin**
**II kursunun 204-cü qrup tələbəsi**

# Ulu öndər Heydər Əliyevin 90 illik yubileyinə həsr edilmiş "Qadın zorakılığına qarşı qanun" mövzusunda dəyirmi masa




Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) aprel ayının 19-da "Qadın zorakılığına qarşı qanun" mövzusunda keçirilən dəyirmi masada YAP-ın Siyasi Şurasının üzvü, Milli Məclisin deputatı, ADPU-da Birləşmiş Millətlər Təşkilatının İnkişaf Proqramı çərçivəsində yaradılmış "Gender, Təhsil və Araşdırma Mərkəzi"nin rəhbəri Məlahət Həsənova, həmin qurumun baş koordinatoru, Bakı Dövlət Universitetinin dosenti Tamam Cəfərova, Azərbaycan Qızıl Aypara Cəmiyyətinin (AQAC) ADPU bölməsinin sədri, professor Jalə Qədimova, YAP-ın ADPU Qadınlar Şurasının sədri, dosent Laçın Həsənova, AQAC-ın "Sağlamlıq və qayğı şöbəsi"nin müdiri Mətanət Qaraxanova, "Təmiz Dünya Qadın Zorakılığına Qarşı Mübarizə Cəmiyyəti"nin sədri Mehriban Zeynalova, həmçinin universitetin professor-müəllimləri və tələbələri iştirak edirdilər.

Dəyirmi masada çıxış edən AQAC-ın ADPU bölməsinin sədri, professor Jalə Qədimova bildirmişdir ki, hazırda xalqımız ümummilli liderimiz Heydər Əliyevin 90 illik yubileyi ərəfəsindədir. Ulu öndər Heydər Əliyev müstəqil Azərbaycan dövlətinin xilaskarı və qurucusu, müasir milli inkişaf strategiyamızın banisidir. Müasir Azərbaycan cəmiyyətinin ideya-konseptual prinsiplərinin təşəkkül tapması, həmçinin milli-mənəvi dəyərlərimizin qorunması və yüksək səviyyədə təbliğ edilməsi dahi liderimiz Heydər Əliyevin adı və fəaliyyəti ilə bağlıdır. Xalqımız öz dahi və müdrik oğlu Heydər Əliyevin 90 illik yubileyini böyük ruh yüksəkliyi ilə qeyd edir. Bizim bugünkü dəyirmi masamız da ulu öndər Heydər Əliyevin 90 illik yubileyinə həsr edilib.

Professor J.Qədimova qeyd etmişdir ki, ulu öndər Heydər Əliyev 34 ildən çox davam edən ictimai-siyasi fəaliyyətində həyatımızın digər sahələri kimi, elm və təhsilə böyük qayğı və diqqət göstərmişdir. Ulu Öndər eyni zamanda öz idarəçilik və dövlətçilik fəaliyyətində həmişə qadınlara yüksək səviyyədə qayğı və diqqət göstərmişdir. Hazırda ulu öndər Heydər Əliyevin müdrik ideyalarını uğurla davam etdirən Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev qadınlarımızın hüquq və azadlıqlarının qorunması, onların ictimai-siyasi həyatda fəal iştirak etmələri və dövlət idarəçiliyində layiqincə təmsil olunmalarına xüsusi diqqət yetirir. Ölkənin birinci xanımı, Heydər Əliyev Fondunun prezidenti, millət vəkili, YUNESKO-nun və İSESKO-nun xoşməramlı səfiri Mehriban Əliyevanın fəaliyyəti hər birimiz üçün layiqli nümunə, dəyərli örnəkdir. Professor J.Əliyeva öz çıxışında həm də təmsil etdiyi AQAC-a dövlət səviyyəsində göstərilən qayğı və diqqətdən razılıq etmiş, bu qurumun ADPU bölməsinin son vaxtlar həyata keçirdiyi çoxsaylı xeyriyyə tədbirləri barədə məlumat vermişdir.

Dəyirmi masada çıxış edən millət vəkili Məlahət Həsənova və digər şəxslər Azərbaycanda gender bərabərliyinin qorunmasının dövlət siyasətinin tərkib hissəsi olduğunu və bu sahədə beynəlxalq təcrübəyə uyğun mükəmməl hüquqi qanunvericilik bazasının yaradıldığını bildirmişlər.

**Samir ƏZİZOV,**
**Tarix fakültəsinin IV kursunun**
**404-cü qrup tələbəsi**

Aprel ayının 17-də keçirilən elmi konfransı giriş sözü ilə fakültənin dekanı, dosent Mətanət Əsgərova açdı. XX əsrin sonlarında respublikamızın yenidən müstəqillik əldə etməsini tarixin Azərbaycan xalqına əvəzsiz bəxşişi kimi qiymətləndirən dosent Mətanət Əsgərova əldə olunan müstəqilliyin qorunmasında ulu öndər Heydər Əliyevin misilsiz xidmətlərinin olduğunu söylədi. Böyük Yaradanın hökmü, xalqımızın inadlı və təkidli tələbi ilə respublikamızda ikinci dəfə siyasi hakimiyyətə gələn ümummilli lider Heydər Əliyevin ölkəmizi vətəndaş müharibəsi və parçalanmaq təhlükəsindən xilas etdiyini xüsusi qeyd etdi. Respublikamızda müasir dövlətçilik ənənələrinin Heydər Əliyev tərəfindən formalaşdırıldığını, müstəqilliyimizin və suverenliyimizin sarsılmazlığının, iqtisadiyyatda davamlı inkişafın təmin olunmasının, Azərbaycanın beynəlxalq miqyasda tanınmasının və gündən-günə artan nüfuzunun məhz Heydər Əliyevin müstəsna xidmətləri olduğunu diqqətə çatdırdı.

Dosent M.Əsgərova dedi: “1923-cü ilin 10 may tarixi Heydər Əliyevi Azərbaycana bəxş edib, Heydər Əliyev də özlüyündə Azərbaycan xalqına müstəqil, suveren Azərbaycan dövlətini bəxş edib. Ona görə də hər il onun doğum gününü bayram səviyyəsində, dünyadan köçdüyü günü isə milli hüzn günü kimi qeyd edirik. Bu il Ümummilli Liderin 90 illik yubileyi Azərbaycan Prezidenti cənab İlham Əliyevin sərəncamı ilə dövlət səviyyəsində keçirilir. Bugünkü elmi konfransımız da ulu öndər Heydər Əliyevin 90 illik yubileyi ilə bağlı təsdiq edilmiş tədbirlər planına daxil olan tədbirlərdən biridir”-dedi. Dekanı olduğu fakültənin tələbələrinin də Ümumimilli Liderin 90 illik yubileyinə həsr edilmiş elmi-praktik konfrans və müsabiqələrdə, sərgi və idman yarışlarında fəal iştirak etdiklərindən bəhs etdi. Fakültə idmançılarının, xüsusilə voleybol komandalarının (həm qızlardan, həm də oğlanlardan ibarət komandaların) Heydər Əliyevin 90 illik yubileyi şərəfinə təşkil edilən idman yarışlarına daha fəal qatıldıqlarını, may ayının 10-da fakültədə ilk dərslərin Heydər Əliyevə həsr olunacağını söylədi.

Dosent M.Əsgərovanın çıxışında Ümummilli Liderin ölkə gənclərinin himayədarı, azərbaycanlı gənclərin cəmiyyətimizin fəal bir hissəsi olması fikirləri xüsusi vurğulandı. “Gənc nəslin sosial-mənəvi mövqeyi, fikir və düşüncələri, həyati problemləri, ictimai inkişafımızdakı rolu Heydər Əliyevi daim dərindən düşündürürdü” dedi. Heydər Əliyevin hələ sovetlər dönəmində respublikamızda hərbi kadrlar yetişdirilməsi məsələsinə xüsusi diqqət yetirdiyini söyləyən natiq bu gün “Coğrafiya və çağırışaqədər hazırlıq” adla-

# “Heydər Əliyev Azərbaycanın iqtisadi inkişaf strategiyasının yaradıcısıdır”

## *Coğrafiya və çağırışaqədər hazırlıq fakültəsinin ümummilli lider Heydər Əliyevin 90 illik yubileyinə həsr etdiyi elmi konfrans*

nan fakültənin hələ 1981-ci ildə Heydər Əliyev tərəfindən hansı maneələr, çətinliklər bahasına yaradıldığından, respublikamız müstəqillik əldə edəndən sonra həmin hərbçilərin ölkənin müstəqilliyinin qorunmasında fədakarlıq nümunələri göstərmələrindən söz açdı: “Ümummilli Liderimizin respublikamızda milli hərbi kadrlar hazırlanmasındakı müstəsna xidmətləri hamıya məlumdur, o cümlədən bu fakültənin yaradılması yolunda göstərdiyi fədakarlıq da. Fakültə 32 il bundan əvvəl - 1981-ci ildə “İbtidai hərbi hazırlıq və fiziki təlim” adı ilə yaradılıb. Amma fakültənin yaradılması haqqında SSRİ Nazirlər Sovetinin qərarı ondan üç il əvvəl - 1978-ci ildə olmuşdu. Fakültənin ilk dekanı bu gün universitetimizin Tərbiyə işləri üzrə prorektoru vəzifəsində çalışan professor Rafiq Baxşəliyev olmuşdur. Fakültənin ilk müdavimlərindən (bu, 1985-ci ildə olmuşdur) Adıgözəlov Zülfü Hüseyn oğlunun, Hüseynov Famil Mübariz oğlunun, Əsədov Mübariz Mayıl oğlunun, Əhmədov Ağabala Canbala oğlunun, Səlimov Vahid Tofiq oğlunun, Məmmədov Ağaverdi Məmməd oğlunun və başqalarının adlarını iftixarla çəkə bilərəm. Ulu Öndər Azərbaycanımızın müstəqilliyini öncədən görürmüş. Belə olmasaydı, respublikamızın hələ Sovetlər Birliyinin tərkibində olduğu illərdə ölkəmiz üçün hərbi və digər sahələr üzrə milli kadr hazırlığına xüsusi diqqət yetirməzdi. Belə ki, Azərbaycanımız öz müstəqilliyini bərpa edəndən sonra məhz həmin illərdə keçmiş SSRİ-nin müxtəlif tanınmış ali məktəblərində təhsil almış azərbaycanlı gənclər dövlət quruculuğu işinə cəlb olundular. Elə zaman oldu ki, keçmiş SSRİ-nin ali hərbi məktəblərində təhsil alan azərbaycanlı gənclərin sayı 700-800-ə çatdı. Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ münaqişəsi başlayanda ilk olaraq sinəsini irəli verənlər də elə həmin nəslin nümayəndələri oldular ki, onların arasında təbii olaraq “İbtidai hərbi hazırlıq və fiziki təlim” fakültəsinin məzunları da var idi. Heydər Əliyev onlarla qürur duyurdu. Görüşür, problemləri ilə maraqlanır, həlli yollarını tapırdı. Şəhid məzunlarımız arasında Azərbaycanın Milli Qəhrəmanı olanlar (Mirələkbər İbrahimov və Mətləb Quliyev), Vətənin yüksək hərbi mükafatlarına layiq görülənlər var. Ulu Öndərin 90 illik yubileyi ərəfəsində Azərbaycanın qurucusu və xilaskarı olan bu böyük insan haqqında düşündükdə fakültəmizin şəhid qəhrəman övladları da qürurla xatırlanır, iftixarla yad edilir”.



Dosent M.Əsgərova çıxışında Ulu Öndəri “Azərbaycan xalqının xilaskarı”, “Müstəqil Azərbaycan dövlətinin memarı”, “Azərbaycan gəncliyinin himayədarı” adlandırdı. Heydər Əliyev siyasətində ədalətli cəmiyyət quruculuğu ideyalarının, humanizmin, insan hüquq və azadlıqlarının qorunmasının, cəmiyyətdə qanunçuluğun hökm sürməsi kimi amillərin başlıca yer tutduğunu söylədi. Göstərdi ki, Azərbaycanımızın başının üstünü almış bütün qaranlıqlara aydınlıq gətirən bu insanın fəaliyyətinin bütün mərhələlərində haqq-ədalət, humanizm, qanunçuluq, sosial ədalət prinsipləri, bu prinsiplərin ictimai şüurda möhkəmlənməsinə çalışmaq kimi amillər mühüm yer tutmuşdur. Müəllim olaraq bizlər tələbələrimizlə Ümummilli Liderimizin bu yüksək xüsusiyyətləri, həyat amalları barədə mütəmadi olaraq söhbətlər aparmalıyıq ki, onlar hər işdə, əməldə, həyatdakı yaşam tərzlərində Heydər Əliyevdən öyrənməyə, ona oxşamağa çalışsınlar”.

İqtisadi və sosial fənlər kafedrasının baş müəllimi Vaqif Əliyevin “Heydər Əliyev Azərbaycanın iqtisadi inkişaf strategiyasının banisidir” mövzusunda məruzəsi konfrans iştirakçıları tərəfindən rəğbətlə qarşılaşdı. Məruzəçi çıxışında dedi ki, həm Sovet Azərbaycanının, həm də müstəqil Azərbaycanın quruculuq salnaməsinin ən parlaq səhifələri Heydər Əliyev tərəfindən yazılmışdır. Respublika sənayesinin dinamik inkişafını təmin etmək məqsədi ilə geniş islahatlar həyata keçirildi. İlk növbədə maşınqayırma, kimya və neft-kimya, əlvan metallurgiya sənayesində yenidənqurma işləri aparıldı. XX əsrin 70-ci illərinin sonları, 80-cı illərinin əvvəlləri ölkə iqtisadiyyatının inkişafının zirvəsi kimi qəbul edilir. Yaşlı nəslin nümayəndələri həmin illərdə keçmiş SSRİ-nin ən yüksək mükafatlarından olan Ümumittifaq Keçici Qırmızı bayraqlarının Azərbaycana hansı təntənə ilə təqdim edildiyini yaxşı xatırlayırlar.

Bütün bu qürurdoğuran uğurlardan ürəkdolusu söz açan məruzəçi V.Əliyev çıxışında demişdir: “Həmin illərdə Azərbaycanda istehsal olunan 350 adda məhsul dünyanın 65 ölkəsinə ixrac olunurdu. Əslində bugünkü müstəqil, suveren Azərbaycanımız hələ 1969-1982-ci illərdə təməli qoyulmuş iqtisadi potensiala əsaslanır.

V.Əliyev məruzəsinin sonunda demişdir ki, Heydər Əliyevin respublikamız üçün müəyyən etdiyi strateji inkişaf istiqamətləri həmişə xalqımızın xoşbəxt yaşaması kimi müqəddəs bir amala xidmət edəcəkdir.

Sonra məruzə ətrafında çıxışlar oldu. Dekan müavini, dosent Dadaş Ələsgərov, Fiziki coğrafiya kafedrasının müdiri, dosent Nərminə Süleymanova, Ekologiya kafedrasının müdiri, dosent Yavər Əliyev, Fiziki coğrafiya kafedrasının dosenti Alı Əliyev, Fiziki tərbiyə fənlərinin tədrisi metodikası kafedrasının baş müəllimi, Qarabağ müharibəsi iştirakçısı Şikar Şikarov, İqtisadi coğrafiya və coğrafiyanın tədrisi metodikası kafedrasının müdiri Kərəm Bayramov çıxış edərək ulu öndər Heydər Əliyevin respublikamızın müstəqilliyinin bərpasında və sürətli inkişafa nail olması istiqamətindəki əvəzsiz tarixi xidmətlərindən bəhs etdilər.

Konfransda həmçinin görkəmli oftalmoloq alim, akademik Zərifə Əliyevanın da xatirəsi anıldı, bu il onun da 90 illik yubileyinin qeyd edildiyi söyləndi, bu mövzuda çıxışlar oldu. Çıxışlar arasında Fiziki coğrafiya kafedrasının müdiri, dosent Nərminə Suleymanovanın xatirələri xüsusilə yaddaqalan oldu. O, çıxışında dedi: “Mən bu ailəni tanıyırdım. Zərifə xanım çox incəqəlbli, sadə, zarafatı xoşlayan, uşaqla-uşaq, böyüklə-böyük kimi davranmağı bacaran bir xanım idi. Çox mehriban idilər. Heydər Əliyev həyat yoldaşını çox istəyirdi, deyirdi ki, mənim həyatda bir dostum varsa, o da Zərifə xanımdır. Zərifə xanımın yaxşı piano çalmağı var idi. Onlar birlikdə “Sənsiz” romansını oxumağı xoşlayırdılar.

Mən ikinci dəfə Heydər Əliyevi Moskvada, Zərifə xanım dünyasını dəyişəndə gördüm”.

Elmi konfransda yekun sözü söyləyən dosent M.Əsgərova dərin məzmunlu məruzə üçün Vaqif Əliyevə, çıxış edənlərə və ümumiyyətlə, konfransda iştirak edən hər kəsə təşəkkürünü bildirdi.

**Ayətxan ZİYAD**

Redaktor: A. Z. İSGƏNDƏROV

ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyov küçəsi-34, ADPU, Tel.: 498-18-41

Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır

Mətbuat və informasiya şöbəsinin web-portalı www.press.adpu.az Şəhadətnamə № 191

Sifariş: 1624 Sayı: 500 Çapa imzalanıb: 30.04.2013-cü il

ADPU-nun mətbuat və informasiya şöbəsinin kompyuter mərkəzində yığılıb, “Azərbaycan” nəşriyyatında səhifələnib və “Azərbaycan” nəşriyyatının mətbəəsində ofset üsulu ilə çap edilmişdir.